**Laçın yurdu, №1(4), 2012**
**Bakı, "Bəxtiyar-4", 2012. 80 səh.**



Redaksiyanın ünvanı:
**Sabit Rəhman küç. 7**
Əlaqə:
**Tel.: (070) 956-36-22, (050) 205-00-92, (050/055) 362-03-60**
**e-mail: lachinyurdu@mail.ru**


Jurnal 16.03.2010-cu il tarixdə Azərbaycan Respublikasının Ədliyyə
Nazirliyində 3133 №-li reyestrlə qeydiyyatdan keçmişdir.

Bankın adı: **Azərbaycan Beynəlxalq Bankı 5 saylı TURAN şöbəsi**
Bankın kodu: **805142**,
Müxbir hesabı: **0137010002944**,
VÖEN: **9900001881**
SWIFT: **IBAZAZ2X**,
Müştərinin hesabı:
**33821019443136196216**
**Məmmədov Arif Kamran oğlu**
VÖEN:**1401771462**
Intermediary Bank:
**Citibank NA, New York, USA**
Corr. account: **36083186**
SWIFT: **CITIUS33**,
International Bank of Azerbaijan Republic Yasamal Branch
kod: **805142**
USD only Account #:
**33822018403136196216**
**Mammadov Arif Kamran**
INN: **1401771462**

## Bu sayımızda

## Baş redaktordan

Əziz və sadiq oxucular, "Laçın yurdu"nun 2012-ci ildə 1-ci, ümumilikdə isə 4-cü sayı ilə yenidən görüşünüzə gəldik. "Sadiq oxucular" deyəndə təkcə öz yazıları, qohumları, dostları haqqında məlumatlar, foto-şəkillər işıq üzü görəndə deyil, həmişə jurnalımızla maraqlanan dəyərli həmyerlilərimizi nəzərdə tuturuq.

Əvvəllər söyləmişik, indi də o fikirdə qalırıq ki, səhifələrində istənilən mövzuya, imzaya məhdudiyyət qoyulmasa da, dərgimiz ilk növbədə adını daşıdığı bölgənin müstəqil orqanıdır. Yeri gəlmişkən, kiçik bir izahata da ehtiyac var: elektron KİV-lərin, gündəlik qəzetlərin, internet TV-lərin, saytların, xəbər portallarının mövcudluğu şəraitində hələlik operativ fəaliyyətlə bağlı iddiamız yoxdur. Dəyişməyən məqsədimizə yaddaşımızın daim təzələnməsi, tarixi gerçəkliklərə obyektiv baxış, yer-yurd, kənd adlarının araşdırılması, ziyalıların, nüfuzlu şəxsiyyətlərin tanıtımı, dünyadan köçənlərin ehtiramla xatırlanması, yaşlı, orta və gənc nəsillər arasında körpü yaradılması, xüsusi istedadların üzə çıxarılması, yaradıcı insanların əsərlərinə yer ayrılması, bir sözlə, milli-mənəvi dəyərlərimizin qorunub-saxlanması daxildir. Ancaq etiraf edək ki, hədəfimizə doğru "iri addımlarla irəliləməyi", daha doğrusu, oxucularla "dil tapmağı" hələ arzuladığımız kimi bacarmamışıq. Əgər bacarsaydıq...

Diqqətli oxucuların yadındadırsa, jurnalımızın ilk sayında ən azı 500 nəfər abunəçi toplayacağımıza ümid bəslədiyimizi yazmışdıq. Görünür, inamımızda yanılmışıq. Qətiyyən şübhə etmirik ki, məcburi köçkünlük həyatı yaşasalar da, ailə büdcəsinə zərər vurmadan dərgimizə abunə yazılmaq üçün ildə 24 manat xərcləməyə gücü çatan laçınlılar kifayət qədərdir. Onu da bilirik ki, səxavətdə, əliaçıqlıqda ad çıxaran soydaşlarımızın abunə məsələsinə biganə münasibətlərini xəsisliklə əlaqələndirmək mümkünsüzdür. Sadəcə olaraq, ən bahalı bəxşişlərə belə "at deyil, dəvə deyil" təmkini ilə yanaşan dağ adamları "bir parça kağız"dan ötrü pul xərcləməyi heç ağıllarına da gətirmirlər. Az qala milli mentalitetimizə çevrilən bir "fakt"la da hesablaşmalıyıq. Biz yalnız icra strukturlarının göstərişi ilə abunə yazılmağa vərdiş etmişik. Əgər rayon icra hakimiyyətinin başçısı tərəfindən belə bir göstəriş gəlsə, abunəçilərimizin sayı hətta 1000-i keçər. Bizə isə qəlbinin göstərişi ilə könüllü abunə yazılanlar lazımdır. Həm də yaxşı anlayırıq ki, büdcədən maliyyələşən təşkilatlarda çalışanlar "Laçın" qəzetinin potensial abunəçiləridir və onların eyni zamanda "Laçın yurdu"na da abunə yazılması bir az qəliz məsələdir. Onsuz da maddi imkanları aşağı olan ziyalılarımızın seçim qarşısında qalmasını istəməzdik. Yəni "Laçın" qəzetinə abunə yazılmaqla öz missiyasını ye-

rinə yetirən mətbuata az-çox bağlı zümrənin qarşısında "əlavə öhdəlik" qoymaq, minnət vurmaq barədə düşünmürük. Amma fərqindəyik ki, hər kəs "Laçın yurdu" jurnalının "Laçın" qəzetinin alternativi kimi nəşrə başlamadığını dərk etsin və qısqanclıq hissini yaxına buraxmasın. Qoy bütün oxucular bir daha əmin olsunlar ki, "Laçın" qəzeti bu sətirlərin müəllifi üçün çox doğmadır. Dediklərimin təsdiqi olaraq hələ işıq üzü görməyən kitaba yazılan "ön söz"dən xüsusi qeydləri sizinlə bölüşürəm: "Mətbuatda ilk şeirim 1978-ci il aprelin 1-də "Laçın" qəzetinin məsul katibi Elman Mirzəyevin xeyirxahlığı ilə dərc edilib. Redaksiyanın qapısını utana-utana açan bir gənci Elman müəllimin necə mehribanlıqla qarşılamasını, səmimiyyətini indiyədək unutmamışam və yəqin ki, ömrümün sonunadək unutmayacağam. O vaxt şeir, poeziya çox yüksək qiymətləndirilirdi, indiki kimi adiləşməmişdi. İki şeirimin dərc olunduğu həmin qəzeti yağışlı bir gündə atam Şuşada kirayədə qaldığım evə gətirəndə keçirdiyim sevinc hissini sözlə ifadə etmək çətindir. Sonralar qəzet və jurnallarda, almanaxlarda şeirlərim dərc edilsə də, o sevinc hissini bir də yaşamadım.

O gündən "Laçın" qəzeti mənə daha da doğmalaşdı. Qəzetlə əməkdaşlığım başlandı. Təkcə şeirlərim deyil, publisistik yazılarım da qəzetin səhifələrində vaxtaşırı çap olunurdu, artıq imzam tanınırdı".

Elə jurnalımızın nəşrinə qərar verəndə də xəyalən o illərə qayıtdım. Bir zamanlar mənə göstərilən qayğını göz önünə gətirərək öz qarşımda yazı-pozu adamlarına həssaslıqla yanaşmaq tələbi qoydum. Düşündüm ki, yeni bir jurnalın həyata vəsiqə alması ilə istedadlı qələm sahibləri, şair və yazıçılar, publisistlər daha çox, həm də maneəsiz çap olunmaq imkanı qazanacaqlar. Niyyətimiz safdı, dərgimizi açıqfikirli insanların tribunasına çevirməkdə israrlıyıq.

Əziz oxucular, ictimaiyyətlə təmasda "mən" sözünü tez-tez işlətməyi qətiyyən sevmirəm, bu sözün bütün hallarda "biz"lə əvəzlənməsinin tərəfdarıyam. Bəzi məqamlar vardı ki, birinci şəxs əvəzliyinin tək şəklindən istifadə etmək məcburiyyətində qaldım. Əslində isə "mən"imizin mahiyyətində bir tamlıq, bütövlük cəmlənib.

Ümidvarıq ki, yuxarıda "uman yerdən küsərlər" ərkinə tapınıb sizə ünvanladığımız "umu-küsü"dən inciməyəcəksiniz. Dərgimizə abunə yazılıb-yazılmamağınızdan asılı olmayaraq qapımız hər birinizin üzünə açıqdır. Əlində qələm, qəlbində təpər olan, yalnız həqiqəti yazdığına inanan, cəsarətli, eyni zamanda böhtandan və qərəzdən daim uzaq duran yazarlarımızı bizimlə əməkdaşlığa çağırırıq. Unutmayın ki, çap olunmağa layiq yazıların önündə həmişə yaşıl işıq yanacaq. Necə deyərlər, yazmağı sizdən, oxuculara çatdırmağı bizdən...

**ELLƏRİMİZ**

## QASIMUŞAĞI OBASI

Əsrlərlə insan övladı – alimlərimiz, tarixçilərimiz sirli görünən qoca kainatın sirrini öyrənməyə çalışsalar da, nə uzaq keçmişin necə olduğunu, nə də gələcəyin necə olacağını dəqiqliklə öyrənə bilməmişlər. Azərbaycan xalqının tarixi taleyi özünün bütün təkrarolunmazlığı və özünəməxsusluğu ilə həmişə digər xalqlardan fərqlənmişdir.

XVII əsrin axırları, XIX əsrin əvvəlləri Azərbaycan tarixinin ziddiyyətli və mürəkkəb bir dövrü olmaqla bərabər, olduqca çox maraqlı bir dövrü əhatə etmişdir. Belə bir dövrün tən ortasında, XVIII əsrin ortalarında Qarabağ xanlığı yarandığı zaman xanlığın tabeliyində olan Qırxqız yaylasının qərb yamacında yerləşən ərazilərdə, Hacısamlı nahiyəsində Qasımuşağı tayfası Qasımuşağı obasında binə qurmuşdur. Bəzən Qasımuşağı obası dedikdə yalnız indiki Kürdhacı (Qurdqajı) kəndinin ərazisi nəzərdə tutulur, lakin bu doğru deyil. Qasımuşağı obasının ərazisi indiki Laçın rayonunun Hacısamlı, Kürdhacı, Ərikli, Aşağı Qarasaqqal, Yuxarı Qarasaqqal, Şamkənd, Nağdalı, Ələkçi, Bozdağan, Şəlvə və s. kəndlərinin ərazisini əhatə etmişdir. Ona görə də bu obalarda yaşayan əhali yaxın qohumluq əlaqələri olan bir tayfaya, adət-ənənəyə, mədəniyyətə malik olmuşdur.

Qasımuşağı obasının ərazisi 1747-ci ilə qədər Xaçın məlikliyinin Mağavuz nahiyəsinin tərkibində, 1747-ci ildən sonra Qaraçorlu mahalının, 1840-cı ildən sonra Şuşa qəzasının Zəngəzur sahəsinin, 1867-ci ildə Zəngəzur qəzasının, 1930-cu ildən sonra Laçın rayonunun tərkibində olmuşdur. Laçın rayonunun tərkibində olduğu dövr ərzində Kürdhacı sovetliyi adlandırılan obanın tərkibində müxtəlif vaxtlarda müxtəlif kəndlər olmuşdur. 18 oktyabr 1991-ci il tarixindən - Azərbaycan Respublikası öz müstəqilliyini qazandıqdan sonra isə Kürdhacı kənd inzibati ərazi dairəsi adı ilə adlandırılan obanın tərkibində Kürdhacı, Ərikli, Yuxarı Qarasaqqal, Aşağı Qarasaqqal, Hacısamlı kəndlərini və onların ərazisini əhatə edir.

XIX əsrin ortalarından başlayaraq şərq xalqlarının incəsənət mədəniyyətinə artmış maraqlar nəticəsində Avropalı sənətşünaslar Azərbaycanla maraqlanmağa başladılar. Onlardan bir çoxu Qasımuşağı obasının xəritədə olmadığını dəfələrlə qeyd edirdilər. Qeyd edək ki, ən yaxın keçmişimizdə Qasımuşağı obası Kürdhacı kənd sovetliyi adlandırılsa da, xəritədə bunu tapmaq mümkün deyildir. Buna səbəb isə kənd sovetliklərinin (indiki inzibati ərazi dairələrinin) heç bir xəritədə qeyd edilmə-

məsi idi. Bölgədə əvvəllər əsasən "bağdadi", "tağbənd", "xərək", "potuğa", "dam" ("qara dam", "şirvanı dam" və digər yerli şəraitə uyğun yer altı qazmadan düzəldilmiş olan tikililər) adlanan xüsusi tikililərdən tikilmişdir. Zaman ötdükcə yerli tikinti materiallarından daş evlər inşa edilmişdir. Evlərin damı palıd ağacından hazırlanmış taxta kirəmit ilə örtülmüşdür. Belə tikililərdən bir neçəsi ermənilərin törətdikləri məlum 1992-ci il hadisələrinə qədər qalırdı.

Hacısamlı nahiyəsinin ən böyük obalarından biri olan Qasımuşağı obası Qarabağ əyalətinin bir bölgəsi olmuş, Qırxqız yaylaqlarına çox yaxın ərazidə yerləşmiş, əvvəllər köhnə yurd yeri olmuşdur. Hələ 1727-ci ildə Mağavuz nahiyəsi Xaçın məlikliyinin tərkibində yerləşən zaman Osmanlı dövləti Mağavuz nahiyəsinin oba, кənd, qışlaq və məzrələrini siyahıya almışdır. Siyahıyaalma zamanı kəndlərdə əhalinin yaşamadığı qeyd edilmişdir. Burada yaşayan insanlar əsasən heyvandarlıqla məşğul olduqlarından dağa-arana getməli olurdular. Yurd yerləri mövsümi xarakter daşıdığından bəzən bu kəndlərdə əhali müəyyən vaxt ərzində yaşayır, sonra ya yaylağa, yaxud da qışlağa köç edərdi. Xüsusən, çox soyuq, şaxtalı dağ zirvələrində, yaylaqlarda əhali cəmi üç ay yay mövsümündə bu yurd yerlərindən istifadə edərdilər.

Coğrafi mövqeyinə görə Şəlvə, Piçənis, Muncuqlu çaylarının axdığı dərin dərələr vasitəsi ilə dağ silsiləsi yaratmış Qarabağ silsiləsinin cənub-qərb yamacında yerləşən oba ərazidə ən yüksək dağ zirvəsi olan Qırxqız yaylaqlarının (2825 m) ətəyində yerləşmişdir. Obanın ərazisinə qışı quraq keçən, soyuq iqlim tipi hakimdir. Bitki örtüyünə görə obanın ərazisi şberiya palıdlarından ibarət olan dağ-meşə (1000-1700 m), şərq palıdından ibarət olan yuxarı dağ meşə (1700-2200 m), subalp (2200-2500 m) və alp (2500-2800 m) çəmənlikləri qurşaqlıqlarına ayrılır. Subalp qurşağı üçün quraq yamacların bozqırlaşmış və nisbətən rütubətli yamacların mezofil çəmənləri, alp qurşağı üçün müxtəlif otlu çəmənliklərin üstünlüyü və alp xalısının zəif inkişafı ilə səciyyələnmişdir.

Qasımuşağı obasının ərazisində məskunlaşan ilk ailə Qasım Hacı Sam oğlunun ailəsi olmuşdur. XVIII yüzilliyin ortalarında Nadir şah Qırxlı Avşarın ölümündən sonra Hacı Samın nəvəsi Şirin bəyin təklifini qəbul edən Qasım öz uruğ-turuğunu toplayıb, Qaraçorlu mahalının Hacısamlı nahiyəsinə köç edir, Şirin bəyin məsləhəti ilə bu bölgədə məskunlaşır. Ulu babası Qasımın şərəfinə bu obanı Qasımuşağı obası adlandırır. Qasımuşağı obasının ərazisində bərqərar olan hər bir kəndin özünün bir yaranma tarixçəsi var. Belə ki, hələ qədim dövrlərdən babalarımız obada əhalinin artımını hiss etdikdə yararlı torpaqlarda yeni yaşayış məskənləri

salmışlar. Bu minvalla Qasımuşağı obasının ərazisində yeni-yeni obalar, şenliklər bərqərar olurdu.

XVIII yüzilliyin sonu, XIX yüzilliyin əvvəllərində Qərbi Azərbaycanda baş vermiş hadisələrlə əlaqədar Dərələyəz mahalından, Zəngəzur mahalının Qarakilsə bölgəsindən, həmçinin ətraf kəndlərdən gələnlər də Qasımuşağı obasında məskunlaşmış və obada yaşayan əhali ilə qaynayıb qarışmışlar.

Qasımuşağı obasının kəndlərində yaşayan insanlar vaxtı ilə 3, 5, 10 ailədən ibarət olub və bir kişinin övladları idilər. Sovet hakimiyyətinin ilk illərinə qədər Qasımuşağı obasının ərazisində (indiki Kürdhacı kəndinin ərazisində) mövcud olmuş Araxış adlı kənddə (yurd yerində) Qasım öz oğlu İbrahimi məskunlaşdırır (Qasımuşağı tayfasının İbrahimuşağı tirəsi öz adını buradan almışdır). Sovet hakimiyyəti dövründə həmin kəndin əhalisi yaxınlıqdakı digər kəndlərə köçürülmüş, kənd xarabalığa çevrilmiş, yerli əhali bu ərazini "kənd yeri" adlandırmışlar. Eləcə də Aşağı Qarasaqqal adlanan kənddə Əhməd öz oğlu Səmədi məskunlaşdırır (Əhmeduşağı tayfasının Səmədlər tirəsi öz adını buradan almışdır).

Ərazidə yaşayan yerli əhali arasında bu oba daha çox "Qasımuşağı dərəsi" kimi tanınırdı. Obanın ərazisində düzəngah sahələrdə meşələr tamamilə qırılıb təmizlənmiş və həmin yerlər əkin sahələrinə çevrilmişdir. Ərazidə qonur və qəhvəyi dağ-meşə torpaqları ən münbit torpaqlardandır.

Qoyunçuluq, maldarlıq, arıçılıq, xalçaçılıq obada yaşayan əhalinin əsas məşğuliyyətlərindən sayılır. Xalçaçılıq bu obada yaşayan əhalinin əsas məşğuliyyəti olmuşdur. Bu günə qədər qorunub saxlanan Qarabağ xalçaçılıq məktəbinin Cəbrayıl qrupuna aid edilən "Qasımuşağı xalçaları" və "Qasımuşağı tikmələri" Hacısamlı nahiyəsinin inzibati ərazi vahidində yerləşən Qasımuşağı obasında toxunmuş və öz adını da bu obadan almışdır.



**Sultan HÜMBƏTOV**

**MƏKTƏBLƏRİMİZ**

## MƏNİM GÜLƏBİRD MƏKTƏBİM

Güləbird məktəbinin tarixi ötən əsrin 20-30-cu illərinə gedir. O dövrdə Novruzalılar kəndində əvvəlcə ibtidai, sonralar isə yeddiillik və səkkizillik məktəb fəaliyyət göstərirdi. Ətraf kəndlərlə yanaşı uzaq Rəfi və Bayram kəndinin uşaqları da bu məktəbdə oxumuşlar.

...1958-ci ildən başlayaraq hökumət qərarına əsasən xırda kəndlər daha böyük kəndlərlə birləşib fəaliyyət göstərməli idi. Buna görə də Novruzalılar, Abasqışlağı, Orta oba, Məzməzək, köhnə Güləbird, Rəfi, Bayramuşağı kəndləri Həkəri çayının sağ sahilində 3-4 kilometrlik yeni Güləbird kəndini yaradırlar. Əhali daha müasir şəraitə uyğun evlərdə yaşamağa başladılar. O dövrdən də Güləbird 8-illik məktəbi fəaliyyət göstərib. Müharibə və əmək veteranı Hacıağa Hətəmov məktəb direktoru kimi yeni məktəbin tikintisində, fəaliyyətinin genişlənməsində böyük əmək sərf etmişdir.



Məktəbin məzunları 8-ci sinfi bitirdikdən sonra təhsillərini davam etdirmək üçün ya rayon mərkəzinə, ya da Qubadlı rayonunun Muradxanlı kəndinə getməli idilər. Həkəri çayının üzərində körpü olmadığından gənclər qış-yaz aylarında çayı piyada keçməli olurdular. Bu da əlavə çətinliklər yaradırdı. Kənd camaatının çoxsaylı xahişlərinə axır ki, cavab

verildi. 1972-ci ilin sentyabrında Güləbird 8-illik məktəbi orta məktəbə çevrildi.

Orta məktəbin direktoru Təvəkkül Abdullayev təyin olundu. 1974-cü ilin may ayında orta məktəbin ilk buraxılışı bütün kəndin sevincinə səbəb oldu. Bu məzunların içərisində qonşu Cicimli, Qazıdərə kəndlərindən də gənclər var idi.

...1975-ci ildə Güləbird orta məktəbinin ikinci buraxılışı məktəbin tarixində öz uğurları ilə uzun müddət yüksək reytinq qazanmışdır. Belə ki, bu məzunlardan Aydın Cəfərov və Cəbrayıl Qəhrəmanov indiki Bakı Dövlət Universitetinin fizika fakültəsinə, Yaqub Abbasov mexanika-riyaziyyat fakültəsinə, Müsənnif Salahov Azərbaycan Xalq Təsərrüfatı İnstitutunun iqtisadiyyat fakültəsinə, Həsənqulu Quliyev Rus dili və Ədəbiyyat İnstitutunun rus dili fakültəsinə, Salman Sadıxov Azərbaycan İnşaat Mühəndisləri İnstitutunun sənaye və mülki tikinti fakültəsinə, Zoya Abdullayeva Azərbaycan Pedaqoji İnstitutunun coğrafiya fakültəsinə, Sadiq Aslanov, Cavid Musayev, Əhməd Məmmədov isə Azərbaycan Neft-Kimya İnstitutunun mühəndislik fakültəsinə daxil olmuşlar. Sonralar Aydın Cəfərov fizika elmlər doktoru, Cəbrayıl Qəhrəmanov pedaqoji elmlər namizədi elmi adlarını almışlar. Məktəbin o dövrkü məzunlarından Şikar Qasımov tarix elmlər doktorudur, hazırda Azərbaycan Texniki Universitetində fəaliyyətini davam etdirir. Mayor Muxtar Həşimov isə 706 №-li hərbi hissənin tərkibində döyüş əməliyyatlarında komandir olmuşdur, hazırda ehtiyatda olan zabitdir.

Güləbird orta məktəbinin sonrakı buraxılışlarında da uğurlu kadr potensialı yaranmışdır. Kənddən hüquqşünaslar, riyaziyyatçı-fiziklər, tarixçilər, filoloqlar, həkimlər, iqtisadçılar: kənd təsərrüfatı kadrları yetişmişdir. 2005-2010-cu illərdə Milli Məclisin deputatı seçilmiş Sevindik Hətəmov da o məzunların cərgəsində olmuşdur.

Belə məzunların uğur qazanmalarında çox hörmətli müəllimlər Təvəkkül Abdullayev, Qulaməli Hüseynov, Hacıağa Hətəmov, Əliqulu Abbasov, İbrahim Məlikov, Qaytaran Cəfərov, Atakişi Atakişiyev, İbiş Qəhrəmanov, Qərənfil Abbasova, Gilas Cəlilova, Əhməd Baxışov, Süleyman Həsənov, Böyükkişi İsayev, Avdın Allahverdiyev, Köçəri Eyvazovun böyük əməkləri olmuşdur. Bu müəllimlərdən Qaytaran Cəfərov və Əliqulu Abbasov “Metodist müəllim” fəxri adına layiq görülmüşlər. Atakişi Atakişiyev “Maarif əlaçısı” olmuşdur. İndi o müəllimlərin əksəriyyəti haqq dünyasına qovuşmuşdur. Ulu Tanrı onlara qəni-qəni rəhmət eləsin! Onların nəcib əməllərini məzunları uğurla davam etdirirlər.

1983-1985-ci illərdə məktəbin direktoru Atakişi müəllim olmuşdur. 1985-ci ildən bu günə kimi Güləbird orta məktəbinə Tapdıq Abbasov başçılıq edir.

1992-ci il mayın 18-dən - Laçının işğalından sonra məktəb döyüş qərargahına çevrildi. Məktəb məzunları torpaqların müdafiəsinə qalxdılar. Rayon işğal olunsa da, düz 15 ay doğma kəndi, doğma məktəbi mərdliklə qorudular. Əlbəttə, canlı itkilər də verildi...

Şəhid Qorxmaz Eyvazov Azərbaycanın Milli Qəhrəmanı oldu. Rizvan Hümbətov və Eylas Cabbarov "Azərbaycan Bayrağı" ordeni ilə, Gəray Məmmədov "İgidliyə görə medalı" ilə təltif olundular. Əhliman Quliyev, Əfqan Qorçuyev, Şəmsi Abbasov, İsaq Cabbarov, Alış Allahverdiyev, İlhami Nəzərov, Mustafa Abbasov, İslam Aslanov isə şəhidlik zirvəsinə yüksəldilər. Müharibə ərəfəsində məktəbin 500-dən çox məzunu Azərbaycanın müharibə veteranı, 34 nəfər əlil olmuşdur. Məktəb öz məzunları ilə haqlı olaraq fəxr edir, onlarla öyünür, onları ucalarda saxlayır.

...1993-cü ilin sentyabrından Güləbird orta məktəbi Sumqayıt şəhərində 36 saylı Laçın məktəbi kimi fəaliyyətə başladı. Bu illərdə də məktəbin şöhrətli ənənələri davam etmişdi. Məktəbin məzunları müstəqil respublikamızın nüfuzlu ali məktəblərində oxuyub, savadlı kadrlara çevrilmişlər. Məktəbin 2003-cü il buraxılşında 8 nəfər məzundan 5 nəfəri ali məktəbə, 2 nəfəri isə orta ixtisas məktəbinə qəbul olmuşdur. Məktəbin yetirmələrindən 5 şeirlər kitabının, 250-dən çox mahnı mətninin müəllifi, Azərbaycan Yazıçılar Birliyinin üzvü Zahir Abbas, iqtisad elmlər namizədi, hazırda ABŞ-ın Nyu-York şəhərində ixtisası üzrə doktorantura təhsili alan Fəxri Həsənli, şair, publisist Əlibala Ağayev, iqtisad elmləri namizədi Mahir Abbaszadə ilə pedaqoji kollektiv həmişə fəxr edir.

1997-ci ildən şəhid Rizvan Hümbətovun adını daşıyan Güləbird kənd tam orta məktəbinin 2011-ci il buraxılışı da yüksək uğurlar əldə etmişdir. Belə ki, məktəbin 9 məzunundan 7-si ali məktəblərə daxil olmuşdur. Bu gün iftixarla demək istəyirəm ki, hazırkı məktəb kollektivinin 13 nəfəri məhz Güləbird orta məktəbinin məzunlarıdır. Hazırda məktəb Tapdıq Abbasovun rəhbərliyi altında gələcəyə uğurla addımlayır. Çünki, mənim Güləbird məktəbimin şöhrətli tarixi keçmişi vardır...

**Yaqub ABBASOV,**
***Güləbird orta məktəbinin 1975-ci il məzunu,***
***Azərbaycan Respublikasının müharibə veteranı***

**DOST SÖZÜ**

## 45+ ("MEDİA FORUM"UN 7 YAŞINA)




Azər Qaraçənlinin 2011-ci il yanvarın 1-də telefonla göndərdiyi mesajın mətnidir 45+. Yanvarın 1-də 45 yaşım tamam olurdu. Azər 45-ə + işarəsi qoşmaqla "yola – davam" demək istəyirdi.

Yol gedirəm və 2010-cu il dekabrın 30-da "Media forum"da getmiş "45" adlı yazıma + qoyuram.

O yazıda deyilirdi: "Dünyanın virtual dost azarına tutulduğu zəmanəmizdə mən real dostlarla nəfəs alıram. Dostları ən böyük sərvətim sayıram".

+ qoyuram indi. Virtual dostluqların real dostluqları taxtdan saldığı, virtual dostların real dostları yendiyi, onların başını kəsdiyi, qanını içdiyi zəmanəmizdə mənim yalnız real dostlarım var. Mən onlarla nəfəs alıram. Həmin dostlardan biri 45+ mesajını yazan oğlandır – Azər.

"Mən rahat adam olsam da, heç də hər yerdə özümü rahat hiss edən adam deyiləm – hər yerdə və hər adamla işləyə bilmərəm. Azadlığın və mənəviyyatın dəyər olmadığı yerdə olmamışam, yoxam, olmaram". Belə yazmışdım "45"də.

+ qoyuram indi. "Media forum" saytının baş redaktorudur Azər. Mən onun müaviniyəm. Bundan böyük xoşbəxtlik olmaz. Azərdən ötrü demirəm, Hikmətdən ötrü deyirəm. Azadlığın və mənəviyyatın yanında olmaq, onunla birgə çalışmaq, ona müavinlik eləmək. Xoşbəxtlik, böyük xoşbəxtlik nə cür olur?

Neçə illik birgə işimiz zamanı aramızda cəmi bir narazılıq olub. Həmin gün Azər redaksiyadan mənimlə sağollaşmadan getdi.

Azərin bir qərarına qarşı çıxmışdım. Çox dirəşsəm də, Azər qərarını geri götürmədi və axırda əlimdən bezib "sağ ol" demədən evə getdi.

Səhərisi gün mən Azərə vaxtilə "Avropa"da qələmə aldığı "Dostların düşmənçiliyi" yazısını xatırlatdım. "45" yazısında mən bu yazıdan sitat gətirmişəm: "Onlar bir-birlərinə o qədər pislik eləməyə çalışırlar ki,

yaddaşları büsbütün ədavət xatirələriylə dolsun, keçmiş xatirələr dərin bir quyuya düşsün və daha heç vaxt oyanıb hissləri tərpətməsin".

Mənimlə sağollaşmadan getdiyi günün səhərisi Azərə dediyim sözlərin bir hissəsini "45"də yazmışam: "Mənim dostlara ayrı münasibətim var - ədavət xatirələrini yox, ılıq xatirələri üstün tuturam hər vaxt".

+ qoyuram indi. Mən dostun barmağına tikan batmasına da razı olmaram, hətta ürəyimə xəncər batıran dostun.

Mənimlə sağollaşmadan getdiyi gün Azər MƏNİM TƏRƏFİMİ TUTUB sərt bir qərar vermişdi. Amma mən buna qarşı çıxmışdım. Aramızda cəmi bir narazılıq olub. O da belə olub.

Biz virtual dostluqlar və real xəyanətlər zəmanəsində yaşayırıq. Belə zəmanədə yaşamaq çox çətindir. Amma yaşamaq olur. Çünki real dostlar var. Mən bu məşəqqətə ona görə tab gətirə bilirəm ki, Azərin yanındayam, Azər yanımdadır.

İllər öncə babam Əyyubdan yazdığımı xatırlayıram: "19-cu əsrin sonlarında doğulmuşdu. Nə qədər qan-qada gördüyünü ağlım kəsəndə bildim – iki erməni-müsəlman qırğını, rus işğalı, 37-ci il, 41-45 müharibəsi… Bu cür bəlalardan keçə-keçə babam üzündə necə də nur, urvat saxlaya bilmişdi. Qat-qat asan sınaqlar zamanında, üzündən zəhrimar tökülən adamların zamanında buna heyran qalıram".

Azərin üzündə babamın nuru var. O nur tək məni yox, tanıyanların hər birini heyran qoyur. Namərdliyin, xəyanətin at belinə minib belədən-belə çapdığı zəmanədə Azərin mərd, sədaqətli olmasına, bu tozanaqda itib-batmayıb nur saçmasına heyran qalmamaq mümkün deyil.

"Dostları ən böyük sərvətim sayıram. Onları itirmək çox ağırdır" yazmışdım "45"də.

+ qoyuram indi. Çox ağırdır dostları itirmək. Mən virtual dostlardan danışmıram. Onları klaviaturanın "Delete" düyməsi ilə pozurlar. Bəzən heç bir əzab çəkmədən. *("Delete" düyməsindən mənim də xəbərim var. Bəzən o düyməni qəzəblə döyəcləməli oluram – yazı redaktə edəndə. Amma "Delete" düyməsi ilə baş kəsmək də mümkündür, bilirəm).* Real dostun yoxluğu isə canından can aparır.

Mən dost ağrısına – həm bu dünyanı tərk edənlərin, həm dönük çıxanların ağrısına – qalan dostlara görə dözürəm. Onlardan biri Azərdir. Ən birincisi. Ağır günlərimdə az qalıram başımı onun dizinin üstünə qoyum, alnımı ovxalasın, saçlarımı qarışdırsın – babamın dizində yuxuya gedən kimi dərin bir yuxuya gedim, bu ağrıları unudum.

Azər məndən 7 yaş balacadır. Babam bilirəm onu amma.

“Media forum”da çox adamın əməyi var. Redaksiyadan güclü jurnalistlər gəlib keçib. İndi də güclü jurnalistlər var. Cümlə qurmağı “Media forum”da öyrənib məşhurlaşanlar da olub. Yenə olacaq. Amma sayt ən əvvəl bir keyfiyyətinə görə tanınır – onu ədalətli adam yaradıb, ədalətli adam idarə edir.

Azər ədalət hissini hətta ən ağır böhranda belə itirməyən adamdır. Onun yaratdığı, yönəltdiyi saytda haqqı demək azdır. Gərək haqqı elə deyəsən ki, nahaq sınmasın. Bu, “imam üçün ağlayanda yezid üçün də ağla” kimi sadə yanaşma deyil. Bu, yezidə imam yoluna gəlmək şansı tanımaq, haqq olmayana haqqa üz tutmaq imkanı verməkdir. Azər ədalətidir.

Sən haqlısan – “Media forum”a güvən, mövqeyin dərc olunacaq.

Haqsızsan – yenə “Media forum”a güvən, tribuna veriləcək sənə.

Amma sən haqlısan deyə haqsızı söymək, onu aşağılamaq fikrinə düşmüsənsə, “Media forum”a güvənmə.

Sən haqsızsan – yalanı müdafiə edirsən, amma üstəlik, haqq deyəni alçaltmaq, onu təhqir eləmək fikrinə düşmüsənsə, “Media forum”a güvənmə.

Çünki Azər var.

Saytı maliyyələşdirən donor təşkilatın təmsilçisi ilə söhbətimizi xatırlayıram. Bu söhbəti heç bizim işçilərin də hamısı bilmir.

Donor deyirdi ki, dünyada iqtisadi böhrandır, imkan çatmır və müvafiq olaraq “Media forum”un redaksiyasında həm maaşlar azaldılmalı, həm də ixtisar aparılmalıdır.

“Əlbəttə, dünyada iqtisadi böhrandır. Maliyyə çatmır. “Media forum”un redaksiyasında həm maaşlar azaldılmalı, həm də ixtisar aparılmalıdır. Mən bunu başa düşürəm. Və bəyan edirəm ki, mən yalnız bir işçinin maaşını azalda, bir işçini ixtisara sala bilərəm – “Media forum”un baş redaktoru Azər Qaraçənlinin maaşını azalda, onu ixtisara sala bilərəm. Yalnız buna razıyam”. Belə bir cavab verildi donora.

Azərin cavabıdır.

Maaşlar azaldılmadı, ixtisar olmadı “Media forum”da. Çünki Azər oyun oynamırdı. Hamının iqtisadi böhrana boyun əydiyi bir zamanda özü işsiz-gücsüz qalardı, amma işçisinin bir manat itirməsinə “hə” deməzdi.

Azərin cavabını bir də oxuyun: “Mən yalnız bir işçinin maaşını azalda, bir işçini ixtisara sala bilərəm – “Media forum”un baş redaktoru Azər Qaraçənlinin maaşını azalda, onu ixtisara sala bilərəm. Yalnız buna razıyam”.

Bir də oxudunuzmu?

Yan-yörənizə baxın indi. Müqayisədə daha aydın görünəcək mənim necə dostum var.

Yan-yörənizə baxın və daha deməyin ki, həyatımızı sarmış bunca rəzalətin, xəyanətin, namərdliyin qarşılığında Hikmət necə tab gətirir.

Azər var.

Ona görə dözürəm.

Yaşamağa güc tapıram.

Azər…

Dostumdur.

Müdirimdir.

Redaksiya iclaslarında bir dəfə də olsun müavinindən yuxarı başda oturmayan müdir.

Dostlar sağ olsun!



**Hikmət SABİROĞLU**

**QAN YADDAŞIMIZ**

## 20 YANVAR

1990-cı il yanvarın 19-da Mixail Qorbaçov SSRİ Konstitusiyasının 119-cu, Azərbaycan SSR Konstitusiyasının 71-ci maddələrini kobud şəkildə pozaraq, yanvarın 20-dən Bakıda fövqəladə vəziyyət elan edilməsi haqqında fərman imzaladı.

SSRİ Müdafiə Nazirliyi, Daxili İşlər Nazirliyi və Dövlət Təhlükəsizlik Komitəsinin həyata keçirdiyi "Udar" adlı əməliyyatda xüsusi təyinatlı "ALFA" və SSRİ DTK-nın "A" təxribat qrupları əsas rol oynayırdı. Sovet qoşunlarının təcavüzü nəticəsində Bakıda 134 mülki vətəndaş öldürülmüş, 600-dən çox adam yaralanmışdı. Öldürülənlər arasında beş millətin nümayəndələri, 20-dən çox qadın, uşaq var idi.

SSRİ DTK-nın "Alfa" qrupu yanvarın 19-da saat 19.27-də Azərbaycan televiziyasının enerji blokunu partlatdı, respublikada televiziya verilişləri dayandırıldı. Gecə isə qoşun fövqəladə vəziyyət elan edilməsindən xəbərsiz olan şəhərə daxil oldu və əhaliyə divan tutmağa başladı. Bakıda fövqəladə vəziyyətin elan olunması haqqında məlumat isə əhaliyə yalnız yanvarın 20-də səhər saat 7-də respublika radiosu ilə çatdırıldı. Həmin vaxt öldürülənlərin sayı 100 nəfərə çatmışdı. Halbuki, Qorbaçovun Azərbaycana ezam etdiyi yüksək vəzifəli emissarlar həyasızcasına bəyan edirdilər ki, Bakıda fövqəladə vəziyyət elan olunmaya-

caqdır. Bax, əli yüzlərlə insanın qanına batmış, sonralar Nobel sülh mükafatı (?!) almış Mixail Qorbaçov başda olmaqla sovet imperiyası rəhbərliyinin rəzil siması bu idi...

"Qara Yanvar"ın indiyədək özündə saxladığı sirlər çoxdur. 100 cildlik istintaq materialının 69 cildi Bakıdan Moskvaya, keçmiş SSRİ Prokurorluğuna aparılıb və bir daha geri qaytarılmayıb. Azərbaycan xalqının məruz qaldığı bu təcavüz indiyədək bəşəriyyət əleyhinə cinayət kimi beynəlxalq müstəvidə layiq olduğu təsnifatı almayıb. Bu hadisələrə emosiya, kədər, yaxud mübarizlik salnaməsi kimi pafoslu münasibətlə bərabər, bir qədər də soyuqqanlı olub, o hadisələrin gerçək mahiyyətini dünya birliyinin, çeşidli beynəlxalq təşkilatların önünə qoymaq barədə düşünməli, 20 Yanvara beynəlxalq-hüquqi qiymətin verilməsinə çalışmalıyıq.

**ƏDƏBİ İRSİMİZ**

## SEYİD NİGARİ QARABAĞİ



Mir Həmzə Seyid Nigari Qarabaği təkkə-təsəvvüf ədəbiyyatının nümayəndəsi, nəqşibəndi şeyxidir. Qarabağ xanlığının Bərgüşad mahalının (indiki Laçın rayonunun) Cicimli kəndində 1795-ci ildə dünyaya gəlmişdir. Atası Mir Paşa (türk mənbələrində Seyid Əmir Paşa) təxəllüsü ilə tanınan Mir Rüknəddin Əfəndi, anası isə Qızxanım adı ilə tanınan Xeyrənsə xanım olmuşdur.

Həmzə Nigari təhsilini Şəkinin Dəhnə kəndində dövrün alimlərindən dərs alaraq tamamladıqdan sonra mürşid axtarmaq məqsədilə səyahət etmişdir. Yolçuluğu sırasında Mövlanə Xalid Bağdadinin adını eşitmiş və Bağdada getmək üçün yola çıxmış, ancaq Xarputa çatanda Mövlanə Xalidin vəfat etməsi xəbərini almış, sonra Sivasa gəlmiş, daha sonra isə Qarabağa qayıtmışdır. Qarabağda ikən əbəcdadı Həzrət Əlinin mənəvi işarəsi ilə "Hər bir nəfəsi Məsih-isa, hər bir nəzəri naziri kimya" dediyi İsmayıl Şirvaniyə mürid olmaq üçün Kürdəmirə gəlmişdir. Şeyx İsmayılın müridi olmuşdur.

Kürdəmirdə şeyxin yanında mənəvi tərbiyəsinə başlayan Həmzə Nigari şeyxini təqib edərək ardından Anadoluya gəlmiş, Sivas və Amasiyada müxtəlif fasilələrlə 20 ildən çox şeyxinin yanında qalmışdır.

Həmzə Nigari İsmayıl əfəndidən izn alaraq, müqəddəs məkanları ziyarət üçün səfərə çıxmış, əvvəlcə Konyaya - Mövlana Cəlaləddin Rumi

türbəsinə, sonra isə Məkkə, Mədinə, Şam, Qüds şəhərlərinə getmişdir. Ziyarətlərinin sonunda Amasiyaya qayıtmış və bir il sonra seyrisülukunu tamamlayaraq mürşidi İsmayıl Şirvanidən xilafətnamə alıb Azərbaycana dönmüşdür.

Həmzə Nigari irşad fəaliyyətinə Bərgüşad və Bərdə ətrafında başladı. Rusiya ilə Osmanlı dövləti arasında gedən Krım müharibəsi zamanı Osmanlı ordusunda cihada qatılmaq üçün müridləri ilə birlikdə gizlicə Qarsa gəldi. Və ruslara qarşı vuruşdu. Müharibədən sonra Ərzuruma yerləşərək Bakırlar məhəlləsindəki məscidin dərsxanasında üç il qaldı.

Ərzurumdan İstanbula gedən Həmzə Nigari nəhayət Amasiyaya qayıdaraq orada məskunlaşmışdır. Burada uzun müddət təfsir və hədis dərsləri deməklə yanaşı təsəvvüfi fəaliyyətlə də məşğul olmuşdur. Lakin onun fəaliyyətindən narahat olanların şikayətindən sonra Xarputa sürgün edilmişdir.

1886-cı ildə Xarputda vəfat edən Həmzə Nigarinin nəşi vəsiyyətinə uyğun olaraq şeyxinin yanına - Amasiyaya gətirilmişdir. Qazaxlı Hacı Mahmud Əfəndinin himməti ilə Qarabağ, Qazax və Gürcüstandakı müridlərinin də yardımı ilə türbəsi və türbənin yaxınlığında məscid inşa edilmişdir.

Həmzə Nigarinin Məhyəddin Əl-ərəbinin "Fütuhatı-məkkiyyə" əsərinə yazdığı Təvzihat, türkcə və farsca divanı, ayrıca "Nigarnamə" və "Saqinamə" adlı əsərləri vardır. Onun şeirləri Amasiya ətrafında, şərqi Anadoluda, Borçalı, Qazax və Qarabağda yaşayan türklər tərəfindən əzbərləndi, zikr məclislərində sürətlə böyük mistik həyəcanla illərlə mənəvi zövqlə oxundu. Onun Türkiyəyə hicrətindən sonra Şimali Qafqazdan minlərlə insan köçərək Amasiya və ətrafında məskunlaşdı.

Hələ 9 yaşında olanda məna aləmində görüb aşiq olduğu Qarabağ bəyləri nəslinə mənsub və özü kimi eşq əhli Nigar adlı bir qadına görə şeirlərində Nigari təxəllüsünü seçdi.

Divanı Tiflisdə (1908) və İstanbulda (1883) dərc edilmişdir. Farsca divanı da yenə İstanbulda 1911-ci ildə nəşr olunmuşdur.

Həmzə Nigarinin Türkiyə, Azərbaycan, Gürcüstan və Dağıstanda çox sayda müridi və xələfləri olmuşdur. Türkiyə və Azərbaycanda onun nəslindən olan bir çox insan var. Onun xələflərindən bəziləri bunlardır: Oğlu Siracəddin əfəndi, Hacı Mahmud Əfəndi Aslanbəyli, Cəfər Təyyar Paşa, Ömər Kəşfi Dağıstani, Ərzurumlu Mehmet Zakir Əfəndi, Ərzurumlu Xoca Hafiz Osman Siraci, Seyid Həsən Hüsnü Əfəndi əd-Dağıstani, Ağarəhim Ağa Dilbazi, Şahnigar Xanım Rəncur, Qazi Osman Əfəndi, Hacı Zəkəriyyə Əfəndi, Sadi Qarabaği, Hafız Mehmet Kaşif Dağıs-

tani, Trabzonlu Osman Nefi, Dağıstanlı Rəcəb Haberi, Hacı Teyyub Əfəndi, Hacı Mustafa Əfəndi, Postlu Hacı Mahmud Əfəndi, Amasiyalı Payasizadə Hacı Haqqı Əfəndi.

Mir Həmzə Nigari sufi şairdir. Nizami Gəncəvi, İmadəddin Nəsimi, Yəhya Şirvani, Məhəmməd Füzuli, Yunus Əmrə kimi şeirlərində təsəvvüfi mövzuları işləmişdir. XIX əsrdən sonra Azərbaycanda həm əruzla, həm heca ölçüsündə təsəvvüfi şeir yazan divan sahibi, şairdir. Şeirlərində Allah, peyğəmbər və əhlibeyt eşqi və məhəbbəti işlənmişdir. O "Vətən sevgisi imandandır" sözünü rəhbər tutaraq Azərbaycan və Qarabağı da şeirlərində vəsf etmişdir.

Mir Həmzə Nigari öz doğma vətəni Qarabağa çox böyük məhəbbət bəsləmiş, Türkiyədə olduğu vaxtlar Qarabağa olan həsrətini şeirlərində dilə gətirmişdir. Nigari Qarabağın ruslar tərəfindən işğalından sonra yazdığı şeirində bu faciəli hadisənin sinəsinə saplanan xəncər kimi onu iztiraba qərq etdiyini ifadə edir. Bununla birlikdə, sanki o, Qarabağın ermənilər tərəfindən işğal edilib talan ediləcəyini hiss etmiş kimi bugünkü insanların əhval-ruhiyyəsini şeirində əks etdirmişdir:

Sinəmə çəkilən qara dağımdır,
Qara bağrım qanlı Qarabağımdır.
Qan əkər, odlar tökər Miri-Nigari məgər
Yad qılıbdır yenə Qarabağ torpağını.

Eşqin kanı Qarabağdır məkanım,
Bülbülü-şeydayam, cənnət yerimdir.
Əvvəl başdan Qaraqaşdır bostanım,
İndi gülüstanım Qarapirimdir.

Bir qönçə gülünün tarımarıyam,
Görüm abad olsun ol Qarabağı.
Bir gözəl ceyranın giriftarıyam,
Şənlik olsun dağı, bağı, ovlağı.

Gözlərimdən hər dəm qan-yaş tökülür,
Sərvtək qamətim yaytək bükülür.
Sinəmə çal-çarpaz dağlar çəkilir,
Yadıma düşəndə Çilgəz yaylağı.

Xabları Huridir, Mələk mənzərdir,
Sözləri şirindir, şehdü-şəkərdir.
Cənnəti-Məvadır, Hovzi-Kövsərdir,
Qaraqaş yaylağı, Həmzə bulağı.

Ey Nigari, ömrün erişdi payə,
Salmadı başıma ol sərvi sayə.
Can qurban eylərəm peyki səbayə,
Xəbər versə bir gün ol Qarabağdan.



**Hazırladı: Ramil CƏBRAYIL**

**YUBİLEY**



## ELDAR İSMAYIL-70

Çağdaş Azərbaycan ədəbiyyatında layiqli yer tutan tanınmış şair, nasir və publisist, Əməkdar jurnalist Eldar İsmayılın 70 yaşı tamam olur.

1988-ci ildə azərbaycanlıların tarixi Azərbaycan torpaqlarından – indiki Ermənistandan deportasiya olunması ilə əlaqədar olaraq Eldar İsmayıl Bakı şəhərində məskunlaşmış, bədii və publisistik yaradıcılığını bütün gücü ilə burada davam etdirmişdir. Ədibin yurd həsrətli “Ulu Göyçə” adlı ilk kitabı da 1990-cı ildə Bakıda, “Yazıçı” nəşriyyatında işıq üzü görmüşdür.

Bundan sonra bütün ömrünü bədii yaradıcılığa bağlayan Eldar İsmayılın 1988-ci ildə Ermənistanda baş verən hadisələri dolğunluğu ilə əks etdirən “Ermənistan türklərinin 1988-ci il soyqırımı”, “Ağrı dağı qədər ağrılarım var”, “Məndən ötrü Ermənistan yoxdu, yox”, “Şəhid yurdun şəhid övladları” və başqa publisistik kitabları bədxah qonşularımızın bədnam, xəyanətkar əməllərindən bəhs edən dəyərli əsərlərdir.

Yaradıcılığına xalq şairləri Bəxtiyar Vahabzadə, Hüseyn Arif, ədəbiyyat biliciləri akademik Yaşar Qarayev, professor Qara Namazov, professor Mürsəl Həkimov və digər ədəbiyyat tədqiqatçılarının yüksək qiymət verdiyi Eldar İsmayıl qələmini ədəbiyyatın bütün janrlarında sınayan Azərbaycanın ən məhsuldar yazıçılarından biridir. O, 40-a yaxın şeir kitabının, publisistik əsərlərin və tarixi romanların müəllifidir.

Onun Hüseyn İsmayılla birlikdə qələmə aldığı “Göyçənin qisası qalır” romanı Azərbaycan Yazıçılar Qurultayının mötəbər tribunasından son dövrün ən yaxşı nəsr əsərlərindən biri kimi dəyərləndirilmişdir. “Səttaroğlu” və “Zülmətdə parlayan qılınc” romanları da ədəbi ictimaiyyətdə geniş əks-səda doğurmuşdur.

Eldar İsmayılın “Göyçənin qisası qalır” romanı 14 avqust 2009-cu ildə Azərbaycan Respublikasının Prezidenti yanında QHTDDŞ və Mahmud Kaşğari adına Beynəlxalq fond tərəfindən “Soyqırım və erməni təcavüzü” müsabiqəsinin xüsusi mükafatına layiq görülmüşdür.

İllərdən bəri çoxsaylı əsərlərilə geniş oxucu auditoriyası qazanan Eldar İsmayıl təkcə ölkəmizdə deyil, Türkiyənin də elm-ədəbiyyat adamları tərəfindən tanınıb seçilir. Görkəmli türk alimləri Mustafa Özbaş və Zəhra Yılmaz şairin yaradıcılığına çox böyük önəm vermişlər. Müəllifin 2000-ci ildə “Allah amanatı”, 2001-ci ildə “Eldar İsmayıl və seçilmiş

şeirləri" kitabları Ərzurum Universitetində anadolu türkcəsində işlənmiş və dərslik kimi hazırlanmışdır.

Şairin Azərbaycan Atatürk Mərkəzi tərəfindən yüksək dəyərləndirilərək nəşr edilən "Türkün xilaskarı" poeması Türk Dünyası Araşdırmaları Beynəlxalq Elmlər Akademiyasının 12 mart 2007-ci il tarixli qərarı ilə "Türk Dünyasına Xidmət" beynəlxalq mükafatına layiq görülüb.

Şair, publisist, yazıçı Eldar İsmayılın ömrünün otuz ili jurnalistlik fəaliyyəti ilə bağlıdır. O, on beş ildir ki, Azərbaycan Tibb Universitetinin nəşri olan "Təbib" qəzetinin baş redaktorudur. Qəzet bu illərdə öz fəaliyyətini daha da gücləndirmiş, ölkəmizdə baş verən ictimai-siyasi hadisələrə ardıcıl münasibət bildirmişdir.

Vətənini, yurdunu, millətini dövlətini ürəkdən sevən Eldar İsmayıl bütün həyatını ədəbiyyatımızın inkişafına həsr etmişdir.

**"Laçın yurdu"**

## BİR KÖÇKÜN İTİRİB YURD GÜZGÜSÜNÜ

*(Eldar İsmayılın 70 illik yubileyi münasibətilə)*

Bir dərviş yol gəlir çay qırağıyla
Başının üstündə ulduzlar qərib.
Baxtı sərgilənir qəm varağıyla
Qürbət nisgilini yollara sərib.

Bir köçkün itirib yurd güzgüsünü
Yollar ayrıcında köməşib baxır.
İçini yaxdıqca fəryadı, ünü
Tale göylərində şimşəklər çaxır.

Bir qartal qıy salıb dağa, dərəyə,
Qanadı altında dünya dolaşıq.
İndi kələk gəlir qardaş qardaşa,
İnsanlıq bicləşib torpaq qarışıq.

Bir xeyir daldada, min şər qabaqda
İndi öküzlər də buğa çağırılır.
Məddahlıq ilişir dildə, dodaqda,
Gədalar, qanmazlar "qağa" çağırılır.

Bir şair boylanır ümid dalınca
Ömrünü uçurub sözünün üstə.
Bir arzu diləyir ulu Tanrıdan,
Yetmişi üz qoya yüzünün üstə.

**Elnur İRƏVANLI**

## QAN YADDAŞIMIZ

### 31 MART - AZƏRBAYCANLILARIN SOYQIRIMI GÜNÜDÜR

1918-ci ilin mart-aprelində erməni-bolşevik birləşmələri Bakı, Şamaxı, Quba, Muğan və Lənkəranda 50 min azərbaycanlını qətlə yetirmiş, 10 minlərlə insanı öz torpaqlarından qovmuşdur. Təkcə Bakıda 30 minə yaxın azərbaycanlı xüsusi qəddarlıqla öldürülmüşdür. Şamaxıda 58 kənd dağıdılmış, 7 min nəfər (1653 qadın, 965 uşaq) məhv edilmişdir. Quba ərazisində 122, Qarabağın dağlıq hissəsində 150, Zəngəzurda 115, İrəvan quberniyasında 211, Qars əyalətində 92 kənd yerlə yeksan edilmiş, yerli əhali qətlə yetirilmişdir. Azərbaycanlıların bu tarixi şəhərində və onun ətrafında 88 kənd dağıdılmış, 1920 ev yandırılmış, 131 min 970 nəfər isə öldürülmüşdür.

## O KƏND BİZİM KƏNDİMİZDİ

### XIRMANLAR KƏNDİ

8 para kəndi (Xırmanlar, Ağbulaq, Seydallar, Mirallar, Dərəbaşı, Qaradağlı, Haxverdi talası və Şəfilər) əhatə edən Yığın Seyidləri 1938-40-cı illərdə birləşdirilmiş, Xırmanlar, Yenikənd və Ağbulaq yeni ərazi vahidləri kimi tanınmışdır.

Kənd üç tərəfdən hündür dağlarla (şimali qərbdən Öküzölən, İlançıxan, şimali şərqdən Sarıbaba, cənubdan Qalacux dağları) əhatə olunmuş, qərb tərəfi İranın dağları görünənə qədər gözəl bir məkanda yerləşmişdir. Kəndin gözəl təbiəti, diş göynədən səfalı bulaqları, mineral suları, qırmızı palıd, alma, armud, qoz, fındıq və s. ağaclarla zəngin meşələri, geniş əkin sahələri, məhsuldar torpağı vardı.

**Haşiyə:** Mərhum akademik Həsən Əliyev bir neçə dəfə rayon partiya komitəsinin birinci katibi Muradxan Cabbarovla (Allah rəhmət eləsin!) bizim Turşsunun üstünə gəlmişdilər. Həsən Əliyev dedi ki, mən buraları yalnız Karlovı-Varıya bənzədirəm, amma ordan böyük üstünlüyü var. M.Cabbarov soruşdu ki, üstünlüyü nədir? Cavab verdi ki, orda gözəlliyi süni yaradıblar, burda isə hər şey təbiidir. Bu yerlərdə təbii gözəllik mövcuddur.

Kəndimizin camaatı çox gur idi. Böyük Vətən Müharibəsində 70 nəfər kənd sakini həlak olmuşdu. Ancaq kənd əhalisi müharibə dövründə çox qıtlıq çəkməmişdi, çünki bol taxıl, bostan məhsulları (qarğıdalı, kartof və s.) əkirdik. Meşələrdə bol meyvə-qoz, fındıq, alma, armud olur-

du. Hər əmək gününə 3-4 kq taxıl bölünürdü, hətta bir il hər əmək gününə 8 kq taxıl bölündü. Qonşu erməni kəndinin əhalisi bir qış yaza qədər bizim kənddən taxıl daşıdı.

Yığın Seyidlərində sovetin ilk dövrlərində iki kolxoz, bir sovetlik olub. Sonralar kolxozlar birləşib, bir kolxoz, bir sovetlik 1951-52-ci illərə qədər mövcud olub. Həmin illərdə Qarıkaha ilə birləşdirəndən sonra kəndin tənəzzülü başlayıb.

Sovet hakimiyyətinin ilk illərində kəndimizdə bir 7 illik, iki ibtidai məktəb fəaliyyət göstərib. Sonra ibtidai məktəblərlə Xırmanlar kənd 7 illik məktəbi birləşib və 1991-ci ilə qədər natamam orta məktəb kimi fəaliyyətini davam etdirib. Xırmanlar kənd məktəbinin 100-dən çox ali və orta ixtisas təhsilli məzunu peşəkar hüquqşünas, təhsil, səhiyyə, maliyə işçisi və kənd təsərrüfatı mütəxəssisi kimi yetişərək ayrı-ayrı sahələrdə müvəffəqiyyətlə çalışıblar. Tibb elmləri namizədi Talıbov Yusif Məhəmməd oğlu Bakı Travmatologiya Xəstəxanasında şöbə müdiri işləyirdi. 1983-cü ildə avtomobil qəzasında dünyasını dəyişdi.

Yığın Seyidlərin əhalisi demək olar ki, Böyük Seyidlərdən gəlmədir. Kəndin çox nüfuzlu, möcüzəli, savadlı seyidləri olub.

Mənim babam Seyid Kərbəlayı Cabbar, böyük əmim Seyid Məşədi Mehti, Seyid Məşədi Murtuza, Seyid Məşədi Muxtar, Molla Seyid Mustafa, haqqında “Qarabağın seyidləri” kitabında ətraflı məlumat verilən, Ağdamın Yusifcanlı kəndində yaşamış və möcüzələri ilə məşhurlaşmış Seyid Əhməd Seyid Məmməd oğlu, Seyid Əhəd Seyid Abdulrəhim oğlu və bir çox başqaları.

**Haşiyə:** Mənim əmim Məşədi Seyid Mehti çox məlahətli səsə malik idi. Deyirdilər ki, Məşədi Seyid Mehti Xırmanlar kəndində minacət verəndə ətraf kəndlərdə - 8 para kəndimizdə, qonşu Tığik, Ayıbazar, İpək kəndlərində də eşidilərmiş. Biz Məşədi Seyid Mehti əmimə Ağa deyərdik. Ağam Məşədiyə gedənə qədər xanəndəlik edərmiş, hətta Tiflis şəhərində onun oxuduğu “Segah” muğamını vala köçürmüşdülər. Həmin val bizdə 1987-88-ci illərə qədər dururdu. Laçın şəhərində Abbasov İbrahim vardı. Bir gün o valı məndən istədi ki, üzünü köçürtsün, mən də verdim, sonra val it-bata düşdü.

Ağama xanəndə Mehti deyərmişlər. Ümumiyyətlə, bizim kənddə məlahətli səsi olmayan tək-tək adam var idi. Mənim atamın qardaşlarının hamısının, İslam müəllimin, İbrahim müəllimin oğlu Mehmanın, Valehin, Salehin gözəl oxumaqları var idi.

**Məhyəddin CABBAROV,**
***kənd ağsaqqalı***

**HƏMSÖHBƏT**

## HƏLƏ YAŞAMAĞA DƏYƏR ...



Xeyli vaxt idi ki, Laçın ictimaiyyətinin yaxşı tanıdığı, uzun illər müxtəlif məsul vəzifələrdə çalışmış, hal-hazırda isə amansız xəstəliklə mübarizə aparan Səlim Səlimovla görüşməyi planlaşdırırdıq. Doğrusu, ünsiyyətdə olduğumuz, söhbətləşdiyimiz ayrı-ayrı insanlar da Səlim müəllim haqqında bir yazı hazırlamağı məsləhət görürdülər.

Nəhayət, bir bazar günü açıqfikirli ziyalı, milli-mənəvi dəyərlərimizə xüsusi önəm verən, tarixi keçmişimizə həmişə böyük sayqı göstərən Əbülfəz Səfərəliyevin bələdçiliyi ilə qələm dostum Araz Yaquboğlunun da qatıldığı bu görüş baş tutdu.

Görüşə yollanarkən beynimdə fırlanan qarışıq fikirlər məni bir an da olsun rahat buraxmırdı. Zahirən hər zaman yaraşıqlı görünən, zövqlə geyinən, baxışlarından nikbinlik oxunan Səlim müəllimi xəstə vəziyyətində, yataq şəraitində təsəvvür edəndə sarsılır, söhbətimizin məcrasını daha çox bəxtəvər günlərə yönəltmək üçün yollar axtarırdım.

Çox şükür ki, Səlim müəllimi görəndə tamam toxtadım. Sən demə, düşündüklərim əbəs imiş. Hətta amansız xəstəlik belə onun görkəmini, həyat eşqini, sifətindəki kədər qarışıq xoş cizgiləri dəyişə bilməmişdi...

İlk növbədə qonaq-qaralı olduğu şübhə doğurmayan sadə, səliqəli otaqda, çay süfrəsi arxasında Səlim müəllimin ömür yolunu ailə üzvləri ilə birlikdə vərəqlədik:

*Səlim İsmayıl oğlu Səlimov 1941-ci il oktyabrın 11-də Laçın rayonunun Xaçınyalı kəndində anadan olub.*

*1963-cü ildə Azərbaycan Dövlət Universitetinin (indiki BDU) Azərbaycan dili və ədəbiyyatı fakültəsinə qəbul olmuş, 1969-cu ildə dilçi-ədəbiyyatçı, Azərbaycan dili və ədəbiyyatı müəllimi ixtisası alaraq universiteti bitirmişdir.*

*1971-1973-cü illərdə Azərbaycan ÜİLKGİ Laçın rayon Komitəsinin katibi işləmişdir.*

*1973-1975-ci illərdə Bakı Ali Partiya Məktəbinin tam kursunu bitirmişdir.*

*1971-ci ildə 56 saylı seçki dairəsindən XIII çağırış, 1975-ci ildə 51 saylı seçki dairəsindən XIV çağırış, 1979-cu ildə 50 saylı seçki dairəsindən XV çağırış Laçın rayon xalq deputatları sovetinə deputat seçilmişdir.*

*Laçın rayon VII (1978), VIII (1980), IX (1983) partiya konfranslarının üzvü olmuşdur.*

*1986-1988-ci illərdə Azərbaycan KP Laçın rayon komitəsinin II katibi işləmişdir.*

*1990-cı ildə Azərbaycan Respublikasının Xalq deputatı seçilmiş və 1995-ci ilə qədər deputat olmuşdur.*

*1995-ci ildə rayon Xalq deputatları sovetinə deputat seçilmişdir.*

*Ayrı-ayrı illərdə müxtəlif orden və medallarla, o cümlədən Daxili İşlər Nazirliyinin "Əla xidmətə görə" medalı ilə təltif olunmuş, 1988-ci ilin fevral ayından könüllü özünümüdafiə dəstələrinin tərkibində erməni təcavüzkarlarına qarşı gedən döyüşlərdə iştirak etmişdir.*

*10 oktyabr 1993-cü ildə Heydər Əliyevin təntənəli andiçmə mərasimində iştirak etmişdir.*

*Səlim Səlimov 1996-cı ildən təqaüdçüdür.*

Amma xəstəlik təsirsiz də ötüb keçməmiş, ən çox yaddaşına mənfi təsir göstərmişdi. Ona görə də ötən illərlə bağlı xatirələrini dinləmək istəyəndə onun ömür-gün yoldaşı Gülarə xanım Şəmistan qızı köməyimizə çatırdı. Yeri gəlmişkən, bu fədakar türk qadınına sonsuz rəğbətimi mütləq qabartmalıyam. 20 ilə yaxın bir müddətdə ağır xəstəlikdən əziyyət çəkən ərinə alnını turşutmadan sədaqətlə xidmət göstərməsi gənc qızlarımıza ən yaxşı örnək sayıla bilər. Qoy bəzi arsız televiziya aparıcıları öz verilişlərinə adi çətinlikdən bezib ailəsindən üz çevirən, yeni ər axtarışına çıxan "əzabkeşlər"i yox, dar gündə tanınan əsl Azərbaycan xanımlarını çağırsınlar.



Məlum səbəblərdən dağınıq alınan söhbətimizdə vəzifəli şəxslərin insanları daha yaxından tanımaq imkanı qazanmasından, camaatla işləməyin özəlliklərindən danışdıq. Sovet dönəmində və müstəqillik dövründə vəzifə səlahiyyətlərinin oxşar, eyni zamanda fərqli cəhətlərini ay-

dınlaşdırmağa çalışdıq. Bu qənaətə gəldik ki, zamanından və məkanından asılı olmayaraq heç kəsin yaxşılıq etmək fürsətini əlindən almırlar. Bəzi məmurlar öz günahlarını “yuxarılar”ın üstünə atmaqla məsuliyyətdən yayınırlar.



Gah “ötən günə gün çatmaz calasan günü günə” deyimini yada salıb arxaya, gah da “ümid sonuncu ölür” inamına tapınıb gələcəyə boylandıq.

Ətraf kəndlərdə yaşayan yuxarı sinif şagirdlərinin təhsil almasında vaxtı ilə böyük rolu olan Kürdhacı kənd orta məktəbinin tarixi inkişaf yolu göz önündə canlandı. Şəlvə dərəsindən burada oxumağa gələn gənclərə ağuşunu açan qədim tikili - “Qubanın damı” haqqında xoş xatirələr bizi xəyalən o illərə apardı.

Şəhidlik zirvəsinə yüksələn igid oğullardan, bacısı oğlu, Azərbaycanın Milli Qəhrəmanı Oqtay Güləliyevdən söz açanda gözləri dolan Səlim müəllimin babaları Səfəralı kişinin zarafatlarını xatırladanda dodaqları qaçdı.

Onu tez-tez yoluxan qohumların, dost-tanışların diqqətindən razılıqla danışdı, qapısını gec-gec döyənlərə də haqq qazandırdı, incikliyini üzə vurmadı: “Çətin dövrdü, hamının iş-gücü var, heç kəsi qınamıram...”

Söhbətimizin əvvəlində “Böyük şairimiz Məmməd Araz demişkən, “Mən belə dünyanın nəyindən küsüm?” Gör neçə ildir ki, Laçınsızam. Daha tabım-təhrim qalmayıb, ümidin üzülən yeri, səbrin kəsilən vədəsidir...” – söyləyən Səlim müəllim nəvələri Muradın, Rəvanın, qızı Gülnarə xanımın, doğması Elmir Səfərəliyevin əhatəsində bir az şövqləndi, qürurlandı sanki, gələcəyə inamı artdı. Biz isə Səlim müəllimi yoracağımızdan ehtiyatlanıb söhbətimizi bitirməyə tələsdik. Tələsdik ki, həmsöhbətimizdən xoş təəssüratla ayrılaq, istədik ki, qəlbindən, yaddaşından “Hələ yaşamağa dəyər!” nidası silinməsin. Həm də ürəyimizdən keçdi ki, səlahiyyət sahiblərinin “Prezident təqaüdü” üçün təqdim etdikləri növbəti siyahıya Səlim Səlimovun da adı salınsın.

**Arif MƏMMƏDLİ**

**KİTAB RƏFİ**

## "GÜL DƏFTƏRİ"




2011-ci ilin sonuncu ayında "Gül dəftəri" adlı kitab işıq üzü gördü. "Adiloğlu" nəşriyyatında çap olunan, Sarı Aşıq yaradıcılığını bütünlüklə əhatə edən bu kitabın toplayanı və tərtib edəni şair İlham Qəhrəmandır.

Kitabda Sarı Aşığın müxtəlif mənbələrdən götürülmüş 1000-ə yaxın bayatısı, 8 şeiri, 14 tapmaca-bağlaması, haqqında rəvayətlər yer almışdır. Tərtibçi istifadə etdiyi qaynaqlara tənqidi yanaşmış, çoxsaylı deyim və sözlərə, dini-mifoloji məfhumlara, xüsusi adlara aydınlıq gətirməyə çalışmış, cinasları düzgün və anlaşıqlı şəkildə təqdim etmişdir. Sarı Aşığın irsi ilk dəfədir oxuculara tam şəkildə çatdırılır.

Tərəddüdsüz demək olar ki, İlham Qəhrəman tərtib etdiyi bu kitabla qəbri, abidəsi düşmən əsarətində qalan Sarı Aşığa sözdən bir abidə ucaltdı.

**TƏBRİK**

## BAHARDA DOĞULAN QƏLƏM DOSTUMUZ, AD GÜNÜN MÜBARƏK!



Dünyaya baharda gələn, amma həyatın sərt qışından yan keçməyən, uşaqlığından zəhmətə alışan, ali təhsildən öncə əlinin qabarına güvənən, iş-gücdə bərkiyə-bərkiyə arzularını addım-addım gerçəkləşdirən peşəkar jurnalist, publisist, ən əsası xeyirxahlıqdan, insanlara qayğı göstərməkdən xüsusi zövq alan qələm dostumuz Tamxil Ziyəddinoğlunu doğum günü münasibətilə təbrik edirik!

Tamxil Ziyəddinoğlu (Hacıyev) 20 mart 1958-ci ildə Zəngəzur Mahalında, indi Ermənistan adlanan Qərbi Azərbaycanın Qafan rayonunun Kurud kəndində anadan olub. 1973-cü ildə Kurud kənd 8 illik məktəbini bitirib. Orta təhsili Gığı kənd orta məktəbində başa vurub. 1975-76-cı dərs ilində Bakı şəhərindəki 56 nömrəli Texniki Peşə məktəbini fərqlənmə ilə bitirib. 1977-79-cu illərdə Sovet Ordusu sıralarında xidmət edib. Tərxis

olunduqdan sonra fasiləsiz olaraq çilingər, fəhlə, kitabxanaçı və digər işlərdə çalışıb. 1985-ci ildə Azərbaycan Dövlət Universitetinin (indiki BDU) jurnalistika fakültəsinin əyani şöbəsinə daxil olub. 1990-cı ildə Universiteti fərqlənmə ilə bitirib. Elə həmin il təyinatla "Sovet Kəndi" qəzeti redaksiyasına göndərilib. Orada korrektor, müxbir və şöbə müdiri vəzifələrində işləyib. "Respublika" qəzetinin parlament müxbiri olub. 1996-cı ildə Azərbaycan Televiziyasının "Xəbərlər" redaksiyasına dəvət alıb. Hazırda televiziyada "Hərbi vətənpərvərlik" şöbəsinin böyük redaktorudur, "Zireh", "Hünər meydanı" verilişlərinin müəllifidir. 2006-cı ildə "Vətən sərhəddən başlanır" mövzusunda keçirilmiş kino sənəti üzrə müsabiqənin qalibidir. 2008-ci ildə "Bütöv Azərbaycan" qəzetini təsis edib. Qəzetin ilk nömrəsi sentyabrın 15-də - Bakının erməni-rus birləşmələrindən azad olunmasının ildönümündə işıq üzü görüb. Nəşr günü kimi məhz bu tarixi seçməsi həm də onun Azərbaycanımızın mütləq bütövləşəcəyinə inamının ifadəsidir.

İnamında yanılmadığına inandığımız, qəlbində daim Zəngəzur, Qarabağ, Bütöv Azərbaycan sevgisi gəzdirən həmkarımıza cansağlığı, ailə səadəti və yaradıcılıq uğurları arzulayırıq.

**"Laçın yurdu"**

**KİTAB RƏFİ**

## "MÜBARİZ CƏSARƏTİ"




Maarif Köçkünün bu yaxınlarda "Mübariz cəsarəti" adlı şeirlər və poemalar kitabı çap olunub.

Müəllifin oxucuların görüşünə dördüncü dəfə gəldiyi bu kitabda "Mübariz cəsarəti", "Xocalı ağlayırdı", "Nə gözəl anlar idi" və "Hayıf o gözəl çağlar" adlı poemaları və vətənpərvərlik şeirləri cəm olunub.

160 səhifə həcmində olan kitab Azərbaycanın Milli Qəhrəmanı Mübariz İbrahimova həsr olunmuşdur. Əsl vətənpərvər şairin şeirlərinin əvvəlki kitablarındakı əsərləri kimi sevilərək oxunacağına inanırıq.

**POEZİYA**



**Elbrus ABBASOV**

### GƏZİRƏM

Canımın odundan düşüb kəndbəkənd,
"Vətən" deyib mən elimi gəzirəm.
Nərgizli yamacı, çiçəkli dağı,
Ətir saçan hər gülümü gəzirəm,
"Vətən" deyib mən elimi gəzirəm.

Oxşada bilmirəm getsəm də hara,
Küləyin küləyə, qarın da qara.
Həsrətəm illərdir buz bulaqlara,
İtirdiyim hər günümü gəzirəm,
"Vətən" deyib mən elimi gəzirəm.

Nə ömür var gözləyəsən, dözəsən,
Neçə oba, neçə oymaq gəzəsən.
Kimdən küsüb, kimə ağız büzəsən,
Küllüyümün mən külünü gəzirəm,
"Vətən" deyib mən elimi gəzirəm.

İldırımlar sinəsində döyüşən,
Nə söyləsən səda verib deyişən.
Ceyranları qoşalaşıb ötüşən,
Yamaclarda mən selimi gəzirəm,
"Vətən" deyib mən elimi gəzirəm.

Qartal zirvə gəzər uca dayana,
El qarğışı keçsin el dağlıyana.
Elbrus gülürdü hər ağlayana,
İndi, vallah, o dözümü gəzirəm,
"Vətən" deyib mən elimi gəzirəm.

### GÖRMƏDİM

Erkən yaşda bu dünyaya göz açdım,
Könül verdim, könül aldım, söz açdım.
Bu zamanın hər hökmüylə barışdım,
Tamahkarın sədaqətin görmədim.

Dərdin çəkdim, dərdi olan hər kəsin,
Qoymadım ki, yıxılsın, ya büdrəsin.
Tez hay verdim, tez eşitdim el səsin,
Yaltaqların dəyanətin görmədim.

Doğma oldu elin namus-qeyrəti,
Kasıbın da, varlının da hörməti.
Töhmət bildim olan hər bir töhməti,
Yetimçənin cəsarətin görmədim.

Köksüz ağac hər küləyə dayanmaz,
Qotur keçi gəlib kələ tay olmaz.
Qurumsaxlar kişi kimi sayılmaz,
Hərcayının kəramətin görmədim.

Elbrusu dinlə, dostum, düz anla,
İşin sənin kaş düşəydi qananla.
Sən uzaq ol fırıldaqla, yalanla,
Yalançının mən hörmətin görmədim.
***01.07.2009***

## QORXMA

Varın var gətirsə, ağlın düz olsa,
Hörmətin yüksəlsə, sözün düz olsa.
Düzü-düz görməyə gözün düz olsa,
Dünya alışsa da, yansa da qorxma.

Çəkə bilirsənsə elin qeyrətin,
Uca tutursansa onun şöhrətin.
Unutmasan ataların söhbətin,
Yolunu duman-çən alsa da qorxma.

Övladı böyütsən vətəndaş kimi,
Millətini sevsən bir qardaş kimi.
Xalqınla yaşasan bir sirdaş kimi,
Dörd yan yağı-düşmən olsa da qorxma.

Bir Allah üstünə salıbsa ətək,
Nəzəri səninlə olsa Yusiftək.
Bəndə nə kimsədir, qursa min kələk,
Qırx arşın quyuya salsa da qorxma.

Vətəni satılan arxayın yatmaz,
Torpaq dərdi çəkən villa ucaltmaz.
Bil, Elbrus o dağları unutmaz,
Neçə il qürbətdə qalsa da qorxma.

***03.09.2009***

## DAĞLAR

Yurdum, yuvam talan oldu,
Qürbətlik can alan oldu.
Bu ömür də yalan oldu,
Qayıtmadım sənə, dağlar.

Arzularım çıxdı boşa,
Atdım oxu, dəydi daşa.
Çatdım artıq ahıl yaşa,
Düşdüm duman-çənə, dağlar.

Günahı bilmə məndə sən,
Sən gözümün içindəsən.
Məndən nahaq incimisən,
Hay vermirsən mənə, dağlar.

Elbrus gələndən bəri,
Göz baxsa da deyil diri.
Ona saxla qəbir yeri,
Vurmasınlar tənə, dağlar.

***02.05.2008***

**KİTAB RƏFİ**

## "ÖMRÜMÜ ATMIŞAM GÖYÜN ALTINA"




Şair Rizvan Nəsiboğlunun yenicə çapdan çıxan kitabı belə adlanır - "Ömrümü atmışam göyün altına". Kitabda şairin son üç ildə qələmə aldığı vətənpərvərlik, Qarabağ dərdi, məhəbbət mövzulu lirik şeirləri və poemaları yer almışdır.

Vətən torpağına candan bağlılıq, eşqə sadiqlik, saflıq və bəşəri dərdlərlə qolboyun olmaq bu kitabın əsas məziyyətlərindəndir.

Bu kitab şairin "Elçi daşı", "Ömür qələmdən addıyır", "Ey kimsə!..." kitablarından sonra sayca dördüncüdür.

**QAN YADDAŞIMIZ**

## XOCALI SOYQIRIMI

Xocalı soyqırımı Azərbaycan tarixinə ən dəhşətli və faciəli səhifələrdən biri kimi daxil olmuşdur.

Qeyd etmək lazımdır ki, Azərbaycan xalqı 200 il ərzində erməni millətçi-şovinistlərinin davamlı olaraq etnik təmizləmə, soyqırım siyasətinə məruz qalmışdır. Azərbaycan xalqı tarixi torpaqlarından qovulmuş, qaçqına, məcburi köçkünə çevrilmiş və bütün bunlar ermənilər tərəfindən kütləvi qırğınlarla müşayət olunmuşdur. Azərbaycanlıların öz tarixi-etnik torpaqlarından qovulması sovet dövründə də davam etmişdir.1948-1953-cü illərdə Ermənistandan 150 min azərbaycanlı deportasiya olunmuş, Azərbaycanın Kür-Araz düzənliyində yerləşdirilmişdir. 1988-ci ildə isə öz tarixi torpaqlarında yaşayan 250 min azərbaycanlı bu ərazidən qovulmuş, bununla da Ermənistan monoetnik dövlətə çevrilmişdir. 1988-ci ildən Dağlıq Qarabağ ətrafında başlayan hadisələr erməni ideoloqlarının "dənizdən dənizə Ermənistan" adlı sərsəm bir ideyasını reallaşdırmaq cəhdi kəndlərin, şəhərlərin dağılması, on minlərlə günahsız insanın ölümü, yüz minlərlə azərbaycanlının öz tarixi torpaqlarından didərgin düşməsi ilə nəticələndi.

1992-ci il fevralın 26-da Ermənistan hərbi birləşmələri 7 min əhalisi olan Xocalı şəhərində genosid aktı həyata keçirdi. Ermənistan hərbi birləşmələrinin şəhərə hücumu zamanı burada yalnız 3 minə yaxın insan qalmışdı. Çünki, mühasirədə qaldığı 4 aydan artıq zaman ərzində blokadada olduğu üçün əhalinin xeyli hissəsi şəhərdən çıxmaq məcburiyyətində qalmışdı. Xocalı soyqırımı zamanı 613 nəfər ödürüldü, 1000 nəfər müxtəlif yaşlı dinc sakin aldığı güllə yarasından əlil oldu. 106 nəfər qadın, 63 azyaşlı uşaq, 70 qoca öldürüldü. 8 ailə tamamilə məhv edildi, 25 uşaq hər iki valideynini, 130 nəfər valideynlərindən birini itirdi. Faciə baş verən gecə 1275 nəfər dinc sakin girov götürüldü, onların 150-sinin taleyi indi də məlum deyil.

Bütün bunlar erməni hərbçiləri tərəfindən xüsusi amansızlıqla və ağlasığmaz vəhşiliklə həyata keçirilmişdir. Hücumda həmçinin mayor Oqanyan Seyran Muşeqoviçin (Seyran Oqanyan hazırda Dağlıq Qarabağda ermənilərin qeyri-qanuni rejiminin "müdafiə naziri"dir) komandanlığı altında 366-cı alayın 2-ci batalyonu, Yevgeni Nabokixinin komandası altında 3-cü batalyonun, 1 saylı batalyonun qərargah rəisi Çitçyan Valeriy İsayeviç və alayda xidmət edən 50-dən artıq erməni zabit və praporşik iştirak etmişdir.

## BİOQRAFİK TANITIM



### MUSA NƏSİROV

Musa İsa oğlu Nəsirov 1948-ci ildə Laçın rayonunun Zağaaltı kəndində qulluqçu ailəsində doğulub. İlk təhsilini Qorçu kənd orta məktəbində, orta təhsilini isə Laçın şəhərində başa vurub və həmin ildən də əmək fəaliyyətinə başlayıb.

1971-ci ildə Laçın rayon Texnika Birliyində texniki dəyişmə məntəqəsinin rəisi işləyən gənc Musa 1972-73-cü illərdə hərbi xidmətdə olmuş, hərbi xidmətdən qayıtdıqdan sonra Bərdə rayonunun "Sosializm" kolxozunda maşın-traktor parkının müdiri, 1974-cü ildə isə Texnika Birliyində böyük mühəndis-texnoloq vəzifəsinə təyin edilmişdir. Bir ildən artıq bu vəzifədə çalışan M.Nəsirov sonradan öz fəaliyyətini Azərbaycan Dövlət Pedaqoji İnstitutunda (indiki Azərbaycan Dövlət Pedaqoji Universiteti) baş laborant kimi davam etdirir. 1979-cu ildə isə "Avtotraktor və kənd təsərrüfatı maşınları" laboratoriyasının müdiri təyin edilən Musa müəllim 1984-89-cu illərdə həmin institutda "Materiallar texnologiyası" kafedrasında müəllim, 1989-93-cü illər ərzində baş müəllim kimi çalışmışdır.

1993-cü ildə Azərbaycan Respublikası Nazirlər Kabineti İşlər İdarəsinin Qaçqınların və Məcburi köçkünlərin işləri üzrə şöbədə referent, 1999-2002-ci illər ərzində Azərbaycan Respublikası Nazirlər Kabineti İşlər İdarəsinin Qaçqınların və Məcburi köçkünlərin problemləri və miqrasiya şöbəsində böyük referent, 2003-2004-cü illərdə həmin şöbədə baş məsləhətçi vəzifəsində işləmişdir. 2004-cü ildən isə Qaçqınların və Məcburi Köçkünlərin İşləri üzrə Dövlət Komitəsində şöbə müdiri vəzifəsində çalışır.

Hələ gənc ikən S.Ağamalıoğlu adına Azərbaycan Kənd Təsərrüfatı İnstitutunda ali təhsil alan M.Nəsirov bununla kifayətlənməmiş, elmə olan sonsuz maraq və istəyi onu Azərbaycan Elmi-Tədqiqat Əkinçilik İnstitutunun aspiranturasına gətirmişdir.

O, 12 adda elmi-metodik məqalə və tədris vəsaitlərinin müəllifidir. Səmərəli fəaliyyətinə görə müxtəlif vaxtlarda diplom, fəxri fərman və pul mükafatları ilə təltif olunmuş, dövlət qulluğunun kiçik müşaviri ixtisas dərəcəsi almışdır.

Xalqımızın böyük bir hissəsinin ağır mərhumiyyətlərə düçar olduğu o illərdə səlahiyyəti daxilində bütün vasitələrdən istifadə edərək hər kəsə yardım etməyə çalışmış, ehtiyacı olanların ağır həyat şəraitlərinin nisbətən yüngülləşməsinə səy göstərmişdir.

Musa müəllimin qayğıkeşliyi, məqsədyönlü fəaliyyəti heçə getməmiş, onu xalq arasında vətənpərvər ziyalı kimi tanıtmış, hörmət və nüfuz sahibi etmişdir.

## DÜNYA ƏDƏBİYYATI

**Robin ZİGER**

## ZƏFƏR ÜÇÜN DOĞULANLAR
**(Seçməli ixtisarlarla)**

Robin Ziger Londonda qurulmuş bir konsaltinq və struktural (quruluşlandırıcı) təhsil təşkilatı olan "Sieger Group" şirkətinin qurucusudur. Bu şirkət beynəlxalq aləmdə məşhur şirkətlərdən biridir.

Robin Zigerin qurucusu olduğu şirkətin (ortaqlığın) müştəriləri arasında "British Aerospace", "British Telecom", "General Motors", "İBM", "McDonalds", "Microsoft" və "Toshiba" kimi şirkətlər də vardır. Bu ortaqlıq xeyriyyə qurumları ilə işbirliyindəndir və bundan da başqa dünya üzrə təhsil proqramları hazırlanması ilə məşğuldur. Bununla yanaşı Robin Ziger və əməkdaşları il boyu, xalqa "Zəfər üçün doğulanlar" adı altında açıq seminarlar keçirirlər.

Bu əsərin də əsas qayəsi oxucularına ilham vermə, motivləndirmə, kamillik yolunda dönüşdürmə və şövqləndirmədir.

***Kitabın üz və arxa cildindən hikmətli deyimlərin iqtibası:***

***– Sevinc şeylərdə deyil, içimizdədir. – Rixard Vaqner (alman bəstəkarı).***

***– Olanları olduğu kimi görməyirik. Özümüz necəyiksə elə görürük. – Talmud (Yəhudilərin əziz kitabı).***

***– Böyük işlər güclə, zorla deyil, səbatla görülür. – Səmuel Conson (Samuel Johnson).***

***– Nə gövhər (mirvari) ovulmadan cilalana bilir, nə də insan sınaqlar olmadan kamilləşə bilir. – Çin ata sözü.***

***Nə edə bilirsinizsə və ya edə biləcəyinizi xəyal edirsinizsə ona başlayın. Cəsarətin içində düha, güc və sehr vardır. – Yohan Volfhang fon Höte.***

**Giriş**. Bəzən həyat sizə çox ədalətsiz gəlir. Çox çalışırsınız, əlinizdən gələn hər şeyi edirsiniz, fəqət heç bir şey dəyişmir. Ancaq elə kəslər

də vardır ki, kərə yağından tük çəkər kimi nə istəsələr onu həmən əldə edərlər. Bəs nədən bu belədir?

Şotlandiyanın baş şəhəri Qlazqoda çalışan bir praktik həkim olan qağam (atam) aşırı (ifrat) işləmək və stress üzündən əlli iki yaşında öldü. Ömrünü ailəsi və xəstələrinə həsr etmiş bir insanın belə erkən ölümü mənə böyük haqsızlıq kimi gəldi. Hələ bu azmış kimi, bir qədər sonra, iyirmi doqquz yaşında, özü də həyatımda ilk dəfə gerçək bir uğura, müvəffəqiyyətə hazırkən elə mənim özümə bir xərçəng diaqnozu qoyuldu. Bu, fasiləsiz, durmadan çalışmanın bədəli idi.

Həyatımın o dövrünədək başarılı olacağıma, taleyimin mənə şans gətirəcəyinə və güvənliklə, iqtisadi azadlıqla dolu bir ömür sürəcəyimə böyük ümidlər bəsləyirdim. Fəqət qəribə bir şəkildə, gələcəklə bağlı arzularımın fəaliyyətə keçməmi gərəkdirdiyinə rəğmən, bu fəaliyyətə başlayıb başlamamağımın hansısa bir fərq yaradacağına çox az inanırdım. Özgə cür desək, qədərimin bütünlüklə başqa birisinin əllərində olduğunu hiss edirdim. Bu üzdən də sahib olmaq istədiyim başarını gerçəkləşdirmək yerinə onun mənə öz-özünə gəlməsini gözləyirdim. Aradakı fərq çox önəmli idi. Nəticədə, o dönəmdə zamanın yanımdan axıb keçməsinə səssiz bir qəzəb duyaraq, daim başqalarını suçlamağa və ya özümə yalançı bəraətlər bulmağa hazır olaraq bütünlüklə gerçəkləşdirilməmiş bir həyat sürdüm.

Bir çox insan kimi gələcəyin mənə nələr gətirəcəyini gözləyərdim. Başarısız olacağıma inanaraq akademiyaya getdim: haqlıydım. Uğur qazanmayacağıma inanaraq universitetə belə getdim. Yenə haqlıydım. Bunlar özünü doğruldan öncəgörmələr idi.

Xərçəng diaqnozu sanki məni oyatdı. Elə həmin arada kainatın sirrini çözməsəm, yaxud da xoşbəxtliyin sehrli bir metodunu kəşf etməsəm də, uğur qazananların nədən qazandığını anladım.

Sonrakı bir neçə ildə oxuyub incələyə biləcəyim hər şeyi oxudum və təcrübələrindən dərs ala biləcəyim insanlarla söhbətləşdim. Prinsiplərimi konkretləşdirdim və təkbaşına biliklər qazanmanın zor bir iş olmadığını anladım.

Biliyimdən istifadəyə və həyatımı daha fokuslanmış və normal bir tərzdə yaşamağa başladım; dönüşməm dramatik olduğu qədər də konkret və sürətli idi. Keçmişdə yaşadığım əndişə və stress yerini güvən və sakitliyə vermişdi. Özümü həyatla ahəngdə hiss etməyə başladım və bir dostuma dediyim kimi “sonra ayağıma uyğun bir ayaqqabı buldum”. Gələcəyim artıq qeyri-müəyyənliklər labirinti deyildi, zövq gətirən yaşantılarla dolu bir yolçuluq idi. Xoşbəxt idim.

Yeni fəlsəfəmin şəxsi və konkret faydalarını toplayarkən bunları başqaları ilə bölüşmə və onların da bacarmalarına yardımçı olma yönümündə şövqlə doldum. Bu sistemi "Zəfər Üçün Doğulanlar" adını verdiyim iki günlük bir kursa çevirdim. Başlanğıcda kursları öz bölgəmdə pulsuz verirdim. Bu günsə, öncədən niyyət etdiyim kimi, bu, başarı, uğur yaratma mövzusunda fərdlərin və təşkilatların potensialını inkişaf etdirən bir işə dönüşmüş durumdadır.

Qazanmanın yalnızca birinci gəlmək və ya xoşbəxtliyin çoxlu pula sahib olma anlamına gəlmədiyi kimi, başarı, uğur da bir şans məsələsi deyildir. Hamımız zəngin ola biləcəyimiz, fəqət həm də yoxsul ola biləcəyimiz, möhtəşəm bir mövqeyə sahib ola biləcəyimiz, lakin yenə də bədbəxt ola biləcəyimiz paradoksunu anlayır və qəbul edirik.

Başarılı insanlar və işlər öz içində qazananlardır. Uğur zahiri görsəntilərilə birlikdə daxili bir duyğudur. Həyat bir rəhbərlik kitabı ilə (təlimatla) verilməz, ancaq biz onun meydan oxumalarına qarşı dura biləcək daxili qabiliyyətlərlə doğuluruq. Rəhbərlik (təlimat) bizim öz içərimizdədir.

Bu kitabı zamanın ötəsində və daimi olan bilgiyi sizinlə paylaşmaq və qazanma potensialınızı gəliştirəcək, praktiki, tətbiqi qolay olan bir proqramı sizə tanıtmaq üçün yazdım.

Mən Everest dağına dırmaşmadım və ya olimpiadalarda qızıl medal qazanmadım, amma anlamaya gedən yolçuluğumun hər bir addımı bundan geri qalmadı.

Kim olursanız olun, şərtləriniz nə olursa-olsun, bu kitab sizin üçün yazılmışdır. Bu şəxsi bir inkişaf kitabı olmaqdan daha çox, "öz şəxsiyyətini özün inkişaf etdir" mövzusunda bir kitabdır. Ondan sizə ağlabatan görünən və tətbiq edə biləcəyinizi hiss etdiyiniz dərsləri alın və qazanmaq üçün doğulduğunuz zəfərləri qazanacaq qədər inkişaf edin. İstədiyiniz gələcəyi qurmaq üçün bilgini anlayışla birlikdə tətbiq etsəniz həyatınızda bir fərq yarada bilərsiniz. Bu, çox da asan deyildir. Bu yolda səbat, özünü həsr etmə və qərarlılıq gərəkdir. Amma siz bunu edə bilərsiniz. Çünki edə biləcəyinizə inandığınız zaman edə biləcəyinizi bilirəm.



**Səlcuq türkcəsindən çevirəni:**
**Yusif Otaylı**

**BİOQRAFİK TANITIM**

## ŞAHBAZ MURADOV



Şahbaz Musa oğlu Muradov 10 avqust 1940-cı ildə Laçın rayonunun Xumarta kəndində doğulub.

1961-ci ildə o, Azərbaycan Dövlət Universitetini fərqlənmə diplomu ilə bitirmiş, gənc mütəxəssis kimi Azərbaycan SSR EA-nın İqtisadiyyat İnstitutuna elmi işə göndərilmiş və həmin vaxtdan burada çalışır. Ona 1965-ci ildə iqtisad elmləri namizədi, 1972-ci ildə iqtisad elmləri doktoru alimlik dərəcəsi, 1977-ci ildə isə professor elmi adı verilmişdir. O, 1961-1966-cı illərdə kiçik elmi işçi, 1966-1968-ci illərdə baş elmi işçi vəzifələrində işləmiş, 1968-ci ildən isə İnstitutun "Demoqrafiya və iş qüvvəsinin təkrar istehsalı" şöbəsinə rəhbərlik etmişdir. Eyni zamanda 1991-ci ildən İnstitutun elmi işlər üzrə direktor müavini vəzifəsində çalışmış və 1999-cu ilin əvvəlindən İnstituta rəhbərlik etmişdir.

Professor Şahbaz Muradovun apardığı başlıca tədqiqat işlərinin nəticələri 350 çap vərəqi həcmindən çox olan 225 əsərdə öz əksini tapmışdır. Həmin əsərlərin 25-i iri həcmli monoqrafiyalar, kitab və broşüralardan ibarətdir. Bu əsərlərin 10-u keçmiş SSRİ-nin və başqa xarici ölkələrin görkəmli alimləri ilə birlikdə yazılıb.

Professor Şahbaz Muradov 40 ildən artıqdır ki, elmi yaradıcılıqla yanaşı, həm də respublikamızın bir sıra ali təhsil müəssisələrində "Siyasi iqtisad", "İqtisadi nəzəriyyə", "Demoqrafiya", "Əməyin iqtisadiyyatı və sosiologiyası" fənlərindən dərs deməklə, ali təhsil sahəsində kadr hazırlanması işinə də köməkliyini göstərməkdədir.

2001-ci ildən AMEA-nin müxbir üzvi olan Şahbaz Muradovun rəhbərliyi və bilavasitə köməkliyi ilə 50 nəfərdən çox namizədlik və 10 nəfər doktorluq dissertasiyası müdafiə etmişdir. O, Azərbaycanda və başqa MDB ölkələrində yaşayan müxtəlif millətlərin nümayəndələrindən olan 40-dan çox adamın namizədlik və doktorluq dissertasiyasına rəsmi opponentlik etmiş, onlarca elmi kitabın redaktoru və rəyçisi olmuşdur.

Professor Şahbaz Muradov Azərbaycan Elmlər Akademiyası İqtisadiyyat İnstitutunun nəzdində fəaliyyət göstərən İxtisaslaşdırılmış doktorluq elmi şurasının sədri, YUNESKO-nun Azərbaycan Respublikasında "Bioetika elmi bilikləri və texnologiyaların etikası" üzrə Milli Komitənin

üzvü, bir sıra elmi şuraların və jurnalların redaksiya şuralarının üzvü və s. kimi də mühüm ictimai fəaliyyət göstərir, mətbuat, radio və televiziyada, ayrı-ayrı əmək kollektivlərində respublikamızın müasir ictimai-iqtisadi durumunun, yeni iqtisadi sistemə keçidin sosial-iqtisadi və demoqrafik problemlərinə dair məqalələr yazıb çap etdirmək, məruzə, çıxış və müsahibələr verməklə Azərbaycanın müstəqilliyinin qorunub saxlanması və möhkəmləndirilməsi işində fəal iştirak edir və ona xidmət göstərir.

Əsas elmi əsərləri sırasına "Azərbaycan SSR-də qadın əmək ehtiyatlarından istifadənin sosial-iqtisadi problemləri" (Bakı, "Elm", 1974), "Azərbaycan SSR-də əmək ehtiyatlarından istifadənin ictimai-iqtisadi problemləri" (Bakı, "Elm", 1978), "Müasir mərhələdə demoqrafiya siyasəti" (Bakı, "Elm", 1986), "Azərbaycan SSR-in əmək ehtiyatları: nəzəri-metodoloji və sosial-iqtisadi aspektlər" (Bakı, "Elm", 1987) və "Bazar iqtisadiyyatına keçidin aktual problemləri: nəzəri-metodoloji və sosial-iqtisadi aspektlər" (Bakı, "Elm", 1994) daxildir.

**PUBLİSİSTİKA**

**İmdad ƏLİZADƏ**



## YOL AĞRISI
## (II yazı)

Mühasirədən çıxmaq istəyənlər arasında xeyli əsgər də vardı. Bir əsgər çayın kənarında çəkmələrini çıxarmış, silahını dizinin üstünə qoyub daşın üstündə oturmuş, ayaqlarını suya salmışdı. Anam hirslə "Dur, nəyə oturmusan, sən də dur mənimlə qaç" dedi.

Əsgər yerindən qalxdı, ağlaya-ağlaya əlindəki avtomatı göstərib "Xala, sənə qurban olum, mən bununla nə eləyə bilərəm, iki gün postda ac-susuz qalmışıq, bir də onda xəbər tutmuşuq ki, hamı gedib, biz qalmışıq" dedi.

Yol boyu çox əzabla üzləşirdik. Demək olar, iki gün idi ac-susuz yol gedirdik. Bu müddətdə suyumuz da, qidamız da qardı, gedə-gedə yol qırağından qar götürüb yeyirdik. Qarlı, palçıqlı yollarla, sonu görünməyən dağ yamacları ilə gedib erməni mühasirəsindən çıxmaq lazım idi. Oğuldərə sakini Əşrəf İlyasovun iki körpəsinin vəziyyəti isə daha pis idi. Uşaqların - Dağbəyi İlyasovun dörd, Xaləddin İlyasovun isə iki yaşı vardı. Ac-susuz körpələr yol boyu ağlayır, sakitləşmək bilmirdilər.

Yol boyu isə eyni mənzərə ilə rastlaşırdıq - insanların tərk etdiyi kəndlər, piyada gedən qoca-uşaq, nalə çəkib ağlayan qadınlar, silahı çiynində mühasirədən çıxmağa çalışan əsgərlər, yiyəsiz mal-qara, sahibsiz itlər...

Axşama yaxın Kəlbəcərin Nadirxanlı kəndinə çatdıq. Bu kənd Tərtər çayının sahilində yerləşir. Kəndi ermənilərin işğal etdiyi deyilirdi. Qaranlıqda yavaş-yavaş kəndin yuxarı hissəsində yerləşən dəmir körpüyə yaxınlaşdıq. Kənddə sakitlik idi. Körpüdən keçib yolumuza davam etdik.

Gecə saat 2 radələrində Kəlbəcərin Sarıdaş kəndinə yetişdik. Zülmət qaranlıq idi, adam özündən qabaqda gedəni görə bilmirdi.

Burada vəziyyətimiz daha da ağırlaşdı. Sarıdaş kəndi dağın döşündə yerləşir, yoxuşu qalxanda atlılardan çox geridə qaldıq. Elə bildik qabaqda bizi gözləyəcəklər, lakin Sarıdaşa çatanda məlum oldu ki, atlılar gedib. Çıxılmaz vəziyyətə düşmüşdük, nə edəcəyimizi bilmirdik. Çünki heç kim bura bələd deyildi, yolun bizi hara aparacağını bilmirdik. Gecənin bu vaxtında yolu tanımaya-tanımaya getmək isə təhlükəli idi, ermənilərin hansı istiqamətdən gəldiyini, harada mövqe tutduğunu bilmirdik. Dəfələrlə yüksək səslə atlı gedənləri çağırdıq, lakin cavab verən olmadı. Bir neçə nəfər bir qədər irəli getdi, az sonra qayıtdılar, dedilər ki, heç kim yoxdur. Hamı ağlayırdı, atlılardan gileylənirdi.

Sarıdaşda bir evdən zəif çıraq işığı gəlirdi. Bir neçə nəfər ehtiyatla işıq gələn evə yaxınlaşdıq, ev yiyəsini çağırdıq. Qapıya orta yaşlı kişi çıxdı. Vəziyyəti ona izah etdik. Sarıdaş kəndindən olduğunu, burada bələdçi qaldığını, səhərə yaxın, alaqaranlıqda burada toplaşan insanları Kəlbəcərin Qamışlı kəndinə - Murova aparan yola çıxaracağını dedi.

Bələdçidən yolumuza davam etmək istədiyimizi, bu yolun hara getdiyini, qarşıda hansı kəndlərin olduğunu, Murova aparan yola necə çıxa biləcəyimizi soruşduq. Getməyimizi məsləhət bilmədi. Dedi ki, nabələd adam gecənin bu vaxtında Murova gedən yola çıxa bilməz. Çünki yolun bir hissəsi meşəlikdən keçir, yol qardır. Ondan öyrəndik ki, ermənilər hazırda Kəlbəcərin mərkəzindədir, Qamışlı körpüsü, Murova aparan yol tutulmayıb, ermənilər hələ həmin yerlərə gəlib çıxmayıblar. Bələdçi Qamışlıdan axşam qayıtdığını bildirdi.

Yolun kənarında bizi gözləyən insanların yanına qayıtdıq, onlarla birlikdə Sarıdaş kəndinin evlərindən birinin qarşısına getdik. Evin ya qapısını, ya da pəncərəsini açıb içəri girmək, bələdçinin nə vaxt yola düşəcəyini gözləmək istəyirdik. Bu zaman bələdçi özünü yetirdi. Bildirdi ki, kəndi ona tapşırıblar, evlərin qapı-pəncərəsinə əl vurmağımıza razı olmadı.

İki gündür piyada yol gəlirdik, aclıq, susuzluq, soyuq bizi taqətdən salmışdı. Bələdçiyə izah etməyə çalışdıq ki, ermənilər arxamızca gəlir, kəndi sənə əmanət edə bilərlər, amma təkbaşına bu kəndi ermənilərdən qoruya

bilməzsən, biz evi dağıtmayacağıq, orada bir necə saat qalacağıq. Ona təklif etdik ki, evlərin birinin qapısını aç, orada gecələyək, soyuqdan donuruq. Amma bu sözlərin ona heç bir təsiri olmadı, bələdçi dediyindən dönmədi.

Evin həyətində tövlə vardı. Qışdan qalan otu bağlayıb tövlənin talvarına yığmışdılar. Ot bağlamalarını yerə tökdük, onun arasında gecələdik.

Qardaşım Babək də atlılarla getmişdi. Anam özünə yer tapa bilmirdi.

Mən yalnız onu xatırlayıram ki, ot bağlamalarının arasına girən kimi yuxuya getdim. Səhər alatoranda anamın səsinə ayıldım, məni yuxudan oyatdı, yola düşürdük. Gecə Sarıdaşa xeyli insan yığılmışdı, erməni mühasirəsindən çıxmaq üçün qalan yeganə yol buradan keçirdi.

Ac-susuz yenidən yola düşdük. Bu ərazilərdə yollar qarlı, palçıqlı idi, hərəkət etmək asan deyildi. Günorta saatlarında Qamışlı kəndinin yuxarısında yerləşən dağlara qalxdıq. Ermənilər Kəlbəcərin mərkəzi hissəsini, Qamışlı ilə üzbəüz yerləşən, çayın qarşı tərəfindəki kəndləri işğal etmişdilər, evlərə od vurmuşdular, tüstü göyə qalxırdı. Qamışlı körpüsü, bu ərazilər şiddətli top, "Qrad" atəşinə tutulurdu.

Sarıdaşın qonşuluğunda yerləşən kəndlərdə xeyli adam bizə qoşuldu. Bələdçi xəbərdarlıq etdi ki, bundan sonra yolla getmək təhlükəlidir, ermənilər üzbəüz mövqeləri tutmuşdular. Dağın zirvəsinə qalxanda Qamışlıya tərəf irəliləyən insanlar iki hissəyə bölündü. Bir dəstə qarlı və palçıqlı meşənin arası ilə, digər hissə yolla getdi. Yolla getmək təhlükəli olduğuna görə meşənin arası ilə Qamışlıya - Murova gedən yola tərəf getdik. Bu ərazi son üç gündə qət etdiyimiz ən çətin yol oldu. Qar, palçıq, yaş xəzəl... Meşədən çıxmağımız heç də asan deyildi, bir neçə saat çəkdi.

Qamışlıda yolun qırağında qapıları açıq böyük bir mağaza vardı. Mağazaya girib sarafan torbada olan təxminən bir kilo konfeti götürdüm. Bu bizim son üç gündə dilimizə dəyən yeganə qida idi.

Qamışlıya çatanadək gecə bizdən ayrılanlardan heç kimi tapa bilmədik. Əslində onları soruşmağa heç kim yox idi, hamı öz canının hayında idi, başına çarə qılmağa çalışırdı, kimdən soruşasan. Anam isə sakitləşmirdi, elə hey Babəki haylayırdı - səsini eşidib gələr ümidi ilə. Babəkdən isə səs-soraq yox idi, o cümlədən digər atlılardan.

Qamışlı körpüsünə düşəndə Babəki yolun kənarında tapdıq. Soyuqdan donmuş, bozarmış, pərişan halda dayanıb bizi gözləyirdi. Bizi görəndə ağladı, dili söz tutmurdu, çətinliklə dedi ki, səhərdən burada dayanıb. Anam Babəki görəndə çox sevindi. Bu sevinc də göz yaşlarına səbəb olmuşdu, qardaşımı bağrına basdı.

Gecə bizdən ayrı düşənləri burada tapdıq. Yol kənarında yerləşən bir evə düşüb bizi gözləmişdilər. Evə toplandıq. Bu ev Kəlbəcərdə gördüyümüz başqa evlərdən fərqlənmirdi, sahibi evdən heç nə götürmə-

mişdi, bütün əmlak, əşyalar yerində idi. Gecə atlı gedənlər dedilər ki, elə bildik arxamızca gəlirsiz, yolda dayanıb gözlədik, amma gəlmədiniz, geri qayıtmağa da ehtiyat etdik.

Sobalar yanır, çay qaynayırdı. Lakin Qamışlıda dayanmaq mümkün olmadı. Evə yenicə toplanmışdıq ki, ətrafa top, "Qrad" mərmiləri düşdü. Bir stəkan çay icməyə amanımız olmadı.

Qamışlını tərk edib Murovdağ istiqamətində yola düşdük. Düşmən caynağından qurtulmaq üçün ən çətin yol bundan sonra başlayırdı. Qarlı və şaxtalı Murovu aşmaq lazım idi, özü də piyada. Qamışlıdan yola düşəndə Murovun ətəyində yerləşən Yanşaq kəndində dayanmaq, imkan olsa orada gecələyib səhər tezdən Murovu aşmaq haqda razılaşdıq. Yoldaşlar dedilər ki, üç gündür yol gəlirik, yorulub əldən düşmüşük, aclıq-susuzluq bizi haldan salıb, Murov isə qarlı-şaxtalıdır, belə vəziyyətdə dağı aşa bilməyəcəyik, dağda qar, şaxta bizi qırar, Murova qalxdın, gərək dayanmayasan. Ona görə də gecə Yanşaqda qalıb səhər tezdən Murovu aşmaq istəyirdik. Düşmən aman versəydi.

Anam tam taqətdən düşmüşdü. Üç gün idi piyada yol gəlirdi, orta yaşlı qadın üçün bu heç də asan deyildi. Anamın ayaqları şişmişdi, partlamışdı, bir neçə yerdə yara vardı, qan axırdı. Yaraları incitdiyinə görə onu ata mindirmək də mümkün deyildi. Babək yenə atı mindi. Atlı və piyada olanlar getdilər, anam isə yeriyə bilmirdi. Tez-tez dayanmalı olurduq. Anam dedi, yorulmuşam, ayağımı yerə basa, yeriyə bilmirəm, yaralar məni incidir, mənə başınız qarışacaq, sizi erməyinə qırdıracam, məni gözləmə, get, arxadan gəlib çataram. Lakin bununla razılaşmadım, anamın yanında qaldım. Gah qolundan, əlindən tutur, gah da bir qədər qabağa gedib onu gözləyirdim. "Bir az da gəl", "az qalmışıq", "çatırıq" kimi sözlərlə anamı uşağı dilə tuturmuş kimi ovuda-ovuda, çox çətinliklə Yanşaq kəndinə gəlib çıxdıq. Qamışlıda mağazadan götürdüyüm konfet köməyimizə gəldi, bizə böyük toxtaqlıq verdi.

Yoldaşlar Yanşaq kəndində yol qırağındakı bir evə düşmüşdülər. Odun sobaları yanırdı, qadınlar xəmir yoğurmuşdular, çay dəmlənmişdi, xeyli toyuq kəsilib təmizlənmişdi, qazanlarda qaynayırdı. Burada məlum oldu ki, bir neçə nəfərin ayağını qar yandırıb. Uşaqların, qadınların vəziyyəti ağır idi.

Yığışdığımız evin yaxınlığında Azərbaycan ordusunun əsgərləri bir neçə top və "Qrad"la post qurmuşdu. Oradan qarşı tərəfə - ermənilərin mövqeyinə bir neçə dəfə zərbə endirildi. Az sonra ermənilər ərazini davamlı atəşə tutdular. Bizim Yanşaqda qalmağımız mümkün olmadı. Hazırlanan çaydan, yeməkdən dadmamış Yanşaqdan qaçmalı olduq. Xəmir ləyəndə, yeməklər qazanda qaldı.

**QARABAĞ QAZİLƏRİ**

## ƏLİ ƏHMƏDOV



Əli Baxşeyiş oğlu Əhmədov 1966-cı ildə Laçın rayonu, Şamkənd sovetliyinin Bozdağan kəndində doğulmuşdur. 1983-cü ildə Şamkənd orta məktəbini bitirərək Nağdalı sovxozunda əmək fəaliyyətinə başlamış, sonra iş yerini dəyişərək Şamkənd orta məktəbində pioner baş dəstə rəhbəri işləmişdir.

1985-ci ildə hərbi xidmətə çağırılmış, 1987-ci ildə xidməti borcunu şərəflə yerinə yetirərək ehtiyata buraxılmışdır. Voloq şəhərində hərbi xidmət edən zaman haqqında yerli qəzetdə məqalə verilmiş, hərbi hissədən valideynlərinə və “Laçın” qəzetinə təşəkkür məktubu göndərilmişdir.

Hərbi xidmətdən sonra M.F.Axundov adına Rus dili və ədəbiyyatı İnstitutuna (indiki Slavyan Universiteti) qəbul olunmuş, Şamkənd orta məktəbində ixtisası üzrə dərs demişdir.

Mənfur qonşularımızın torpaq iddiaları minlərlə vətənpərvər gənclərimiz kimi Əli müəllimin də qəlbində düşmənə qarşı güclü nifrət yaratmış, könüllü olaraq Qarabağ müharibəsinə getmişdir. O, qısa müddətdə döyüş yoldaşlarının rəğbətini qazanmış, komandanlığın əmri ilə tağım komandiri təyin edilmişdir. Tərtər rayonunun Talış kəndi ətrafındakı döyüşlərdə xüsusilə fərqlənmiş, Ağdərə istiqamətində gedən döyüşlərdə ağır yaralanaraq ordudan təxris olunmuşdur.

II qrup Qarabağ müharibəsi əlilidir, Qarabağ Əlillər Cəmiyyətinin fəxri üzvüdür. 1998-ci ildən Azərbaycan Vətən Müharibəsi Veteranlar Birliyinin Şəmkir rayon şöbəsində təşkilat işləri üzrə sədr müavini işləyib. 2000-ci ildən isə Binəqədi rayonunda fəaliyyət göstərən Laçın rayon, Sulutəpə 6 №li tam orta məktəbində müəllimdir. Ailəlidir, bir qızı var, həyat yoldaşı həkimdir.

**ARAŞDIRMA**

## ƏSİR VƏ GİROVLAR

1 yanvar 2011-ci il tarixinə qədər əsir, itkin düşmüş və girov götürülmüş şəxslərin sayı 4049 nəfər təşkil etmişdir. Onlardan 3273 nəfəri hərbçi, 771 nəfəri mülki şəxslərdir. 5 nəfərin hərbçi və ya mülki olduğu məlum deyil.

Mülki şəxslərdən 47 nəfəri itkin düşərkən yetkinlik yaşına çatmamış uşaq (17 nəfər azyaşlı qız), 247 nəfəri qadın, 347 nəfəri yaşlı şəxsdir (149 nəfər qadın).

Əsir, itkin düşmüş 4049 nəfərdən 878 nəfərin əsir və girov götürülməsi barədə məlumatlar daxil olmuş, şahid ifadələri alınmışdır.

Əsir və girovluqdan 1399 nəfər azad edilmişdir. Onlardan 343 nəfər qadın, 1056 nəfər kişidir. Eyni zamanda 170 nəfər uşaq (65 nəfər azyaşlı qız), 289 nəfər yaşlı şəxsdir (112 nəfər yaşlı qadın).

Dövlət Komissiyasına daxil olmuş materialların təhlili zamanı 553 nəfərin əsir və girovluqda qətlə yetirildiyi və ya müxtəlif səbəblərdən vəfat etdiyi müəyyən edilmişdir. Onlardan 104 nəfər qadın, 448 nəfər kişidir.

Əsir və itkin düşmüş, girov götürülmüş vətəndaşlarla əlaqədar Dövlət Komissiyasının məlumatlarına əsasən, "Erməni əsirliyində" Beynəlxalq Elmi Araşdırmalar İctimai Birliyinin internetdə olan http://inarmeniancaptivity.net saytında Laçından olan əsir və girovlar haqqında aşağıdakı məlumatlar yerləşdirilmişdir:

**Quliyeva Nabat Polad qızı** 1934-cü ildə Azərbaycan Respublikası Laçın rayonunun Şeylanlı kəndində doğulub. 18 may 1992-ci ildə qızının əri Məmmədov Cümşüd Həsənxan oğlu ilə ermənilər tərəfindən girov götürülüb.

**Əliyeva Qənirə Zülfüqar qızı** 1938-ci ildə Azərbaycan Respublikası Laçın rayonunun Şamkənd kəndində doğulub. 31 mart 1993-cü ildə Ermənistan ordusu tərəfindən Kəlbəcərin işğal ərəfəsində ailəsi və yaxınları ilə birgə ərazini tərk etmək istəyib. Erməni əsgərləri onları gülləbaran etmiş, Qənirə Əliyevanı bir neçə nəfərlə birlikdə girov götürmüşlər.

**Alışova Vəsilə Cəfər qızı** 1976-cı ildə Azərbaycan Respublikası Laçın rayonunun Şamkənd kəndində doğulub. 31 mart 1993-cü ildə Kəlbəcər rayonunun işğalı zamanı ailə üzvləri və yaxın qohumları ilə ərazini tərk edərkən "Tunel" adlanan yerdə güclü atəşə məruz qalaraq mühasirəyə alınmış və girov götürülmüşdür.

**Alışova Qumru Qənbər qızı** 1973-cü ildə Azərbaycan Respublikası Laçın rayonunun Şamkənd kəndində doğulub. 31 mart 1993-cü ildə Kəlbəcər rayonu işğal edilərkən ailə üzvləri və yaxın qohumları ilə ərazini tərk edərkən "Tunel" adlanan yerdə güclü atəşə məruz qalaraq mühasirəyə alınmış və girov götürülmüşdür.

**Məhərrəmova Muhəstə Rüstəm qızı** 1906-cı ildə Azərbaycan Respublikası Laçın rayonunun Minkənd kəndində anadan olub. 17-18 may 1992-ci ildə doğma kəndləri ermənilər tərəfindən işğal olunan zaman oğlanları Məmmədov Qurban Qaraxan oğlu (1924), Məmmədov Nə-

riman Qaraxan oğlu (sonradan dəyişdirilərək girovluqdan azad olub), gəlinləri Məmmədova Nərgiz Bayram qızı (1930), Məmmədova Ceyran Soltan qızı (1934) ilə birlikdə girov götürülüb.

**Məmmədova Nərgiz Bayram qızı** 1927 (1930)-ci ildə Azərbaycan Respublikası Laçın rayonunun Minkənd kəndində anadan olub. 17-18 may 1992-ci ildə Minkənd kəndi ermənilər tərəfindən işğal olunan gün ailə üzvləri və yaxın qohumları ilə birlikdə girov götürülüb.

**Məmmədova Ceyran Soltan qızı** 1934-cü ildə Azərbaycan Respublikası Laçın rayonunun Minkənd kəndində anadan olub. 17-18 may 1992-ci ildə Minkənd kəndi ermənilər tərəfindən işğal olunan gün ailə üzvləri və yaxın qohumları ilə girov götürülüb.

**Qeyd:** 18 may 1992-ci ildə Laçın rayonunun işğalı zamanı ailələri ilə birlikdə girov götürülmüş 1977-ci il təvəllüdlü İbişov Taleh Mədət oğlunun bildirdiyinə görə, ermənilər onun atası İbişov Mədət Əvəz oğlunu və 1967-ci il təvəllüdlü bacısı İbişova Yeganə Mədət qızını vəhşicəsinə öldürmüşlər.

***Hazırladı:*** **Araz YAQUBOĞLU**

## KİMLƏR KEÇDİ BU DÜNYADAN

### ƏMİR RƏSULOV



Yaddaşlarda səmimi insan, çox hörmətli ziyalı kimi qalan Rəsulov Əmir Xanalı oğlu 1935-ci ildə Laçın rayonunun İmanlar kəndində anadan olmuşdur. Orta təhsilini başa vurduqdan sonra Azərbaycan Xalq Təsərrüfatı İnstitutuna (indiki İqtisadiyyat Universiteti) qəbul olunmuş, 1957-ci ildə institutu müvəffəqiyyətlə bitirərək əmək fəaliyyətinə başlamışdır.

1960-cı ildə Azərbaycan Kommunist Partiyasının Laçın komitəsinə üzv seçilmiş, 1964-1966-cı illərdə Bakı Ali Partiya Məktəbində təhsil almışdır.

Bir müddət Laçın rayon İcraiyyə Komitəsinin katibi işləyən Əmir müəllim sonralar da müxtəlif məsul vəzifələri icra edərək ona bəslənən etimadı doğrultmuşdur.

Laçın İstehlak Cəmiyyətinin müvəkkillər yığıncağı tərəfindən Azərbaycan Respublikası İstehlak Kooperasiyasının növbədənkənar XIX qurultayına nümayəndə seçilmişdir. 1978-ci ildən Laçın rayon Əmanət Bankının müdiri, 1988-ci ildən isə Sumqayıt Alüminum Zavodunun Laçın filialının direktoru vəzifəsində çalışmışdır.

Taleyinə "Laçın" qəzetində yaradıcı işlə məşğul olmaq da düşən Ə.Rəsulov doğulduğu kəndi, doğma Laçınını, bütövlükdə Azərbaycanı bütün varlığı ilə sevən, soyuna-kökünə bağlı bir insan idi. Vəzifənin gəldi-gedər olduğunu yaxşı anlayaraq insanları həmişə mehribanlıqla qarşılayıb, gülər üzlə yola salmağı bacarırdı.

2006-cı ildə haqq dünyasına qovuşan Əmir müəllimin 3 oğlu, 2 qızı var. Babaları ilə qürur duyan nəvələri arasında balaca Əmir də böyüyür. Elə həyatın əbədiliyi də nəsillərin bir-birini əvəz etməsindədir.

**<u>ŞƏHİDLƏRİMİZ</u>**



**YARIMÇIQ QALAN ÖMÜR**

1969-cu ilin soyuq qış günü idi. Laçın rayonunun Hacıxanlı kəndində bir ailənin sevinci yerəgöyə sığmırdı. Dünyaya bir oğul övladı göz açmışdı. Adını Fazil qoyduqları bu övlad doğma ocaqda, əzizlərinin qucağında rahatca yatırdı. Ayaqları yer tutanda Fazil yaşıl yamaclara, zirvəsi qarlı dağlara can atır, təmiz dağ havasını ciyərlərinə çəkir və dupduru bulaqların suyunu ovuclayıb doyunca içməyi çox sevirdi.

Elə bax o vaxtdan bu gəncin doğma torpağa, elə-obaya içində sonsuz bir məhəbbət baş qaldırdı. Böyüdükcə bu bağlılıq, bu məhəbbət daha da dərinləşdi.

Bir gün Fazil eşitdi ki, nankor qonşularımız əzəli torpaqlarımıza göz dikiblər. Düşmənin murdar niyyətinə qarşı içində bir qəzəb çağladı. Silaha sarılıb torpaqlarımızı xilas etmək üçün könüllü olaraq cəbhəyə yollandı. 1994-cü ilin mart ayında Tərtər uğrunda gedən döyüşlərdə qorxmazlığı və qoçaqlığı ilə yoldaşlarına nümunə oldu. 1994-cü il may ayının 11-də ağır döyüşlərin birində düşmən gülləsinə tuş gələn Fazil Fətayev əbədi olaraq gözlərini yumdu. Qısa bir vaxt ərzində komandanlığın hörmətini qazanan bu gənc döyüşçünün ömrü yarımçıq qaldı. Allah rəhmət eləsin!

Üz tutdun dağlara sən əsgər kimi,
Girdin döyüşlərə qızmış nər kimi.
Dedin öz sözünü igid ər kimi,
Bir gün sənə oldu şəhidlik qismət,
Fazil, sənə qıyan düşmənə lənət.

**Saleh ŞİRİNOV,**
***Qarabağ döyüşçüsü***

**AXTAR BABALARI...**

## RÜSTƏM MƏCNUNOV



Rüstəm Məcnun oğlu Məcnunov 1892-ci ildə Laçın rayonunun Oğuldərə kəndində anadan olub. Kərbalayı Qəmbərin qızı Xanımla ailə qurub. Üç qız övladından biri dünyasını vaxtsız dəyişib. Kəndimizin ilk iki dini təhsili olanlardan biri - Molla Qasım onun böyük qardaşıdır. İlk təhsilini də qardaşından alıb. Mişnili Abdulla kişinin dediyinə görə, Xosrov bəy hərbi nazir olanda kəndlərdən bacarıqlı və nüfuzlu şəxsləri Bakıya aparmış və yunkerlər məktəbinə qoymuşdur. Bu şəxslərdən biri də dərin zəkaya, gözəl şəxsiyyətə malik Rüstəm idi. Müsavat partiyasının üzvü kimi Azərbaycanın müstəqilliyi uğrunda daim mübarizə aparmışdır. Ona bəylik və zabitlik sənədlərinin verilməsinə üç ay qalanda Sovet hakimiyyəti gəldi və hər şey məhv oldu. Azərbaycanda yeni hökumət qurulandan sonra savadlıları, baş tərpədənləri həbs etməyə başladılar. O zamanlar kənd sovetinin katibinə bərabər tutulan vəzifədə çalışan Rüstəm Məcnunov da həbs olunub və 1934-cü ildə həbsxanada vəfat edib.

**POEZİYA**

## Qulu YUSİFOĞLU



Quluyev Qulu Yusif oğlu 1946-cı ildə Laçın rayonunun Oğuldərə kəndində anadan olub. Orta təhsillidir. Gənc yaşlarından şeir yazmağa başlayıb. Şeirlərindən Vətənə olan məhəbbəti, doğma elə, obaya bağlılığı aydın hiss olunur. Zarafatyana yazılmış bəzi şeirləri, xüsusən də deyişmələri gözəl yumor hissinin olduğundan xəbər verir.

Əvvəllər əsrarəngiz təbiət gözəlliklərindən-əzəmətli dağlardan, göz oxşayan güldən-çiçəkdən, qəlbə rahatlıq gətirən çəmənliklərdən, insana bəzən

həzin, bəzən də şaqraq bir musiqini xatırladan çayların, bulaqların şırıltısından, sıx meşələrdən, quşların cəh-cəhindən yazan şairin son dövrlərdə şeirlərinin əsas mövzusunu yurd həsrəti, Laçın nisgili təşkil edir. Şeirləri ara-sıra qəzet səhifələrində işıq üzü görür, "Söz-sözə" toplusunda bir neçə şeiri çap olunub.

Həyatının qayğısız - Laçınlı, Oğuldərəli, müharibəsiz çağlarında Qulu Yusifoğlu, taleyinə qaçqınlıq düşəndən, gözləri həsrətlə Laçına qayıdacaqları günü gözləməyə başlayandan bəri Yetim Qulu təxəllüsü ilə də şeirlərinə imza atır. Hazırda Xırdalan şəhərində yaşayan şairin bir neçə şeirini sizlərə təqdim edirik.

**BƏNÖVŞƏ**

Mən burda sənsizəm, sən orda mənsiz,
Həsrətdi bir-birə göz, ay bənövşə.
Bir qapı açınca gözəgörünməz
Çəkil bir xəlvətə döz, ay bənövşə.

Durub uşaq kimi ağlamışam ki,
Sənsiz düz gətirmir vallah mənimki.
Elə kövrəlmişəm, yuxalmışam ki,
Tez dəyir qəlbimə söz, ay bənövşə.

Çəmənliklər şehli, bulaqlar sərin,
Mən ki xəstəsiyəm gözəlliklərin.
Çox heyif, qiymətsiz keçən günlərin
Müddəti az oldu, az, ay bənövşə.

Heyranam sirrinə bu təbiətin,
Mən də görməliyəm Tanrı qismətin.
Haqladım altmışı-görüşmək çətin,
Qulunu ha axtar, gəz, ay bənövşə.

**İTİRDİM**

Yenə boğur qəhər məni,
Bir qayğısız el itirdim.
O bəzəkli dağlarımın
Çəmənində gül itirdim.

Zirvələrdə qartalları,
Quzeylərdə dümağ qarı.
Yurd yerindən kəndə sarı
Bir dolayı yol itirdim.

Yetim, əhdin, ilqarın düz,
Dünya oldu mərhəmətsiz.
Ana kimi candan əziz
Vətən adlı ləl itirdim.

**GÜNAHINDAN KEÇ YETİMİN**

Ulu Tanrım, heç kimsənin
Taleyini qara yazma.
Gül həsrətli bülbüllərin
Qismətini xara yazma.

Yenə halım qarışıqdı,
Arzularım dolaşıqdı.
Hər fəsil bir yaraşıqdı,
Üç ay yazı qara yazma.

Dərdin dərddən seç yetimin,
Üzü gülməz heç yetimin.
Günahından keç Yetimin,
Cəzasını dara yazma.

**POEZİYA**



**Elman ELSEVƏR**

### $H_2O$

Nuhdan öncənin suyudu,
...Nuhdan öncəni su yudu.
Bu su, o suyun soyudu,
Nuhdan sonra dönə-dönə
buğlandı qalxdı... soyudu.

Bu çay da Yerin çayıdı,
Yerdə bu yerin çayıdı.
Sağında nəyin qışıdı?
Solunda küzün yayıdı.

Ağ qılıncdı, qını-yaşıl,
Gün altında işıl-işıl...
Burul-burul burulğanı,
gölləri var mışıl-mışıl.
Bölüb getmir, axıb gedir
gah şarhaşar, gah şırhaşır.

Çayım-Həvvanın yaşıdı,
köpürdükcə daş daşıdı.
Baxma rəngi bulanıqdı,
durulanda göz yaşıdı.
Yüz doxsan
çıx bir,
sənədi
bütöv nara baş daşıdı.

$H_2O$-
Nuhdan öncənin suyudu,
...Nuhdan öncəni su yudu.

***2002-ci il***

### ATLILAR

Səhəri geyib,
Sonuncu dənizə!-deyib;
Heyran-heyran
yığıb gözünə səni,
qitə-qitə köçürüb içinə,
nur saça-saça keçdilər içindən;
Əkindən gəldilər,
əkindən,
biçindən getdilər,
biçindən...
Bəs sən hara getdin,
işıqlı geniş dünya?!

Yoxuşlansın enişin,
enişim yoxuşlandı,
yoxuşlu
eniş dünya!

***2000-ci il***

## 20 YANVAR

Bir başını qaldır göyə,
Ayına bax, Gününə bax!
Tank altından çıxıb gələn
günümüzün gününə bax!

Raketlərlə cızıq-cızıq,
mərmilərlə qazıq-qazıq.
Necə baxır üzümüzə
məsum-məsum, yazıq-yazıq.

Günüsümü gününüzün,
saxlancı gün-ününüzün;
Sarı barmaq, yadda saxla,
qaraladın günün üzün!!!

***1990-cı il, yanvar***

## XOCALI QIŞI

başı hanı bu atanın
bu ananın beli sınıb
bu qardaşın başı-
üstə
döş-köks qəfəsi yox
bu körpə salamatdı
salamatdı bu körpə-
nəfəsi yox
boyanıb qırmızıya
qırmızıya boyanıb-
bu bacının elçisi yox
buza dönüb düz dünya
gömgöy buzdu
buz, dünya
bu şaxtanın ölçüsü yox
ölçüsü yox bu şaxtanın
bu şaxtanın öl-çü-sü y o o o x...

***1992-ci il, fevral***

## BEŞAÇILAN TEMİRİN NAĞILI

Qaçaraqda qəmər atın
sıçrayıbdı belinə-
Çox döşləşib dağlarda
qara-qara yel ilə.

Məşum 37-dən
dayandıqca saatlar...
Gün-gün artdıqca at gücü,
gün-gün azaldıqca atlar,
Özü özündə itib,
özün özündə tapmayıb.
indi də ömrünü çapıb Temir baba,
bir də Qəməri çapmayıb...

Göyrüşün xəzəl dəmidi,
çayda avarsız gəmidi.
Dopdoludu Beşaçılan,
tətiksiz naqan kimidi.

## BULAQ SONATASI

Qapqara qaralırsan,
qatran təki necə də-
şırıl-şırıl işararaq
zil qaranlıq gecədə.

Şəffaf görünməyin üçün
gecəsiz gün hardan bulaq;
Rənginə düşən gecənin
rənginə düşən bulaq?

## GƏNC ALİMLƏRİMİZ

### MUĞAN SALMAN OĞLU QULİYEV



Ümummilli liderimiz Heydər Əliyev demişdir: "Laçın rayonu həm zəngin təbiətinə, həm də dəyərli insanlarına görə hər zaman ad qazanmışdır".

Düzdür, hələ ki, Laçınımızın zəngin təbiətindən, göz oxşayan yerlərindən yaza bilməsək də, dəyərli insanlarından birini-Muğan müəllimi sizlərə yaxından tanıtmaq istədik.

Muğan Salman oğlu Quliyev 1965-ci ildə Laçın rayonunun Səfian kəndində dünyaya göz açıb. 1982-ci ildə Səfian kənd orta məktəbini bitirib. Elə həmin il H.Zərdabi adına Kirovabad Dövlət Pedaqoji İnstitutunun (indiki Gəncə Dövlət Universiteti) fizika-riyaziyyat fakültəsinə daxil olub. 1983-cü ildə hərbi xidmətə yollanan Muğan Quliyev 1985-ci ildə hərbi xidmətini başa vurduqdan sonra yenidən təhsilini davam etdirir.

1989-cu ildə daxil olduğu fakültəni müvəffəqiyyətlə bitirir və həmin il institutda laborant kimi işə başlayır.

1990-cı ildən AMEA-nın Mexanika-Riyaziyyat İnstitutunun deformasiya olunan bərk cisimlər mexanikası şöbəsinin dissertantı olub.

1993-cü ildən hissə-hissə "bircins model əsasında əyrivari struktura malik kompozit materiallarda gətirilmiş mexaniki xassələrin tədqiqi" mövzusunda dissertasiya müdafiə edərək fizika-riyaziyyat elmləri namizədi (fizika-riyaziyyat elmləri üzrə fəlsəfə doktoru) alimlik dərəcəsi almışdır. Həmin ildən 2006-cı ilə qədər Mühəndis-pedaqoji fakültəsində dekan müavini, 2006-cı ildən 2011-ci ilə qədər Fizika və texniki fənlər fakültəsinin dekanı işləmişdir.

Hal-hazırda ümumi magistratura şöbəsinin dekanı vəzifəsində çalışır. Qabaqcıl elmi işçidir. Eyni zamanda Mexanika və Riyaziyyat İnstitutunun doktorantı, 30-a qədər elmi məqalənin müəllifidir.

Ailəlidir, üç övladı var. Ən böyük arzusu isə doğma yurdumuza qayıtmaqdır.

*Təqdim etdi*: **Dağbəyi ABBASOV**

**POEZİYA**



**Şöhlət ABBAS**

### MƏNİ

*«Hər gecə yuxuda Laçını görürəm»*
*- deyən həkim dostum*
*Mürsəl Həmidova ithaf edirəm*

Hər gecə görürəm yuxularımda,
Xəyallar aparır gündüzlər məni.
Laçın çiçəklənir duyğularımda,
Bu həsrət xırpalar, dərd üzər məni.

Quşqonmaz yerlərdən keçib gedərəm,
Qədəri-qisməti seçib gedərəm.
Qartallı dağlara köçüb gedərəm,
Çiçək qucaqlayar, gül bəzər məni.

Bir saflıq boylanar bahar-qışından,
Kəkliklər oxuyar qaya başında.
Yenə də sevilib-sevən yaşımda
Tilsimlər qıyqacı bir nəzər məni.

Məhrəm xatirələr sızıldar-sızlar,
Gecikər, vaxtında açılmaz yazlar.
Qalar boynubükük bənövşə qızlar,
Saralar, gözləyər nərgizlər məni.

Hər gecə görürəm, yuxum çin olar,
Həsrət uzaq düşər, qüssə gen olar.
Laçın qollarını açan gün olar,
Elin şad günündə dost gəzər məni.

### BÜLBÜL

Səhər-axşam budaqlarda
Həzin-həzin ötən bülbül.
Nə acıdır yurd həsrəti,
Nə şirindir Vətən, bülbül!

Elə dərddi çəkilməzdi,
Onsuz qəddim bükülməzdi.
Gedən getdi, dözən dözdü,
Yox kamına yetən, bülbül.

Kəc baxışlar məni yordu,
Qəriblərə dünya dardı.
Qazandığım ağ saçlardı,
Gəncliyimdir itən, bülbül.

### BƏNÖVŞƏ

Əyibsən boynunu niyə mənimtək,
Əyilmək yaraşmır düzə, bənövşə?!
Mənim sevincimtək, ay ömrügödək,
Kim səni gətirdi gözə, bənövşə?

Məhəbbətlə keçən hər dəm gözəldir,
Səhərlər üstündə şəbnəm gözəldir.
Yoxsa ki, çəkdiyin bu qəm gözəldir,
Açmaq istəmirsən bizə, bənövşə?

Ey çəmən-tablonun incə naxışı,
Qızların ismətli, məhzun baxışı.
Şöhlətin vəfalı, kövrək yoldaşı,
Gərəkdir dərd əhli dözə, bənövşə!

**XATİRƏ**

## SİRLİ – SORAQLI QİTƏ

Belə bir qənaətdəyəm ki, dünyada təsadüfi heç nə yoxdur. Hər təsadüf əslində zərurəti meydana çıxarmaq üçün bir vasitədi... Səhərin alatoranında Xəzərin sahilində gəzişəndə yenicə bura ayaq açan bir insanla – Qəzənfərlə tanış oldum. Özü mənə yanaşdı, uzun illər Qubadlıda, Gədəbəydə milis rəisi işləyən İliç Kərimovla qohumluq əlaqəmi soruşdu. Dedim ki, İliç Kərimov mənim doğmaca dayımdı, onu haradan tanıyırsan? Qəzənfər dedi ki, sənin dayın mənim ən yaxın qohumum İsfəndiyar Cəbrayılovla yaxın dost, həm də yaxın qonşu idilər. Onunla Qubadlıda və Laçında çoxlu görüşlərimiz olmuşdu...

Söz sözü çəkdi. Söhbət şair Malik Fərruxdan düşdü. Gənclik illərimizin bir yerdə keçdiyini bilən Qəzənfər xahiş elədi ki, Malik haqda bir yazı yazım. Sən demə Qəzənfər Malikin yaxın qohumu və dostu imiş, tələbəlik illərində Bakıda onunla bir otaqda qalırmışlar...

Dənizdən evə qayıdanda yol boyu Maliki xatırladım. Yadıma düşdü ki, ikimiz də eyni ildə – 1966-cı ildə orta məktəbi bitirib Bakıya gəlmişik. O, Laçından, mən Qubadlıdan. Malik indiki Bakı Dövlət Universitetinin jurnalistika fakültəsinə qəbul olunmuşdu, mən isə Azərbaycan Dövlət Pedaqoji Universitetinin filologiya fakültəsinə. Rayonlarımız da ayrı idi, təhsil aldığımız universitetlər də. Ancaq bizim ikimiz də eyni bir “universitet”in – “Ulduz” jurnalının “tələbələr”i idik. Bu jurnalın redaksiyasında tanış olmuşduq. Günümüzün çoxu “Ulduz”da keçirdi. Məmməd Araz, Cabir Novruz, Tofiq Bayram, İsi Məlikzadə, Yasif Nəsirli, Abbas Abdulla, İsa İsmayılzadə, Əhəd Muxtar bu redaksiyada işləyirdilər. Sonra tənqidçi Akif Hüseynovla, o dövrün tanınmış şairi Əhməd Cəmillə də görüşmək, söhbətləşmək qisməti var imiş taleyimizdə. Daha sonra Yusif Səmədoğlu “Ulduz” jurnalının baş redaktoru oldu.

Bu redaksiyada o dövrün görkəmli şair və yazıçılarından kimləri görməmişdik, kimlərin söhbətini dinləməmişdik, İlahi? Doğrudan da, “Ulduz”un redaksiyası biz cavanlar üçün bir məktəb idi, şeir-sənət məktəbi... İsi Məlikzadənin “Əli müəllim, Siz tərəflərdən bir cavan şair var, boy-buxunda eynən Sizə oxşayır” sözlərini eşidən Əli Vəliyevin hirslə qapıdan çıxıb yenidən geri qayıtması, “İsi, hər yoldan ötəni mənə oxşatma” söyləməsini indi də təbəssümlə xatırlayıram...

Ancaq Malik tezliklə sübut elədi ki, o yoldan ötən deyil, sənət dünyasının əsl yolçularından biridir. 1968-ci ildə “Ulduz” jurnalının yed-

dinci nömrəsində Malik Fərruxun "Qartallı dağlar" şeirini oxuyanda çoxumuz ona qibtə edirdik.

*Göylərə ucalıb yolu dağların,*
*Yuyunan buludlar saçı olubdur.*
*Hökmdar dağların, ulu dağların*
*Qartallar başının tacı olubdur.*

*Bir qartal yaranda göyün qatını,*
*Gözləru yol çəkər, düşünər dağlar.*
*Ana təbiətin mükafatımı,*
*Yığıb qartalları başına dağlar?*

*Dostunun yolunda düşəndə dara,*
*Çoxu bu dostluqdan bezər dünyada.*
*Dağlarda gurlayan ildırımlara*
*Qartallar dayanıb dözər dünyada.*

*Qartal qanad çalıb uçanda qıyla,*
*Dərələr boğular harayda, səsdə.*
*Dağın tarixini caynaqlarıyla*
*Qartallar yazıbdır qayalar üstə!*

Şeirin sonrakı bəndlərindəki "Dağların belində yastı yamaclar qartal qanadını ütüləyirlər", "Dar gündə qartalın caynaqlarında hər qaya bir sapand daşına dönər", "Dağdırsa, qartalsız yaşaya bilməz" kimi misralar hamının xoşuna gəlirdi. Özü də bu şeiri Tofiq Bayram bəyənib təqdim eləmişdi baş redaktora. O, Tofiq Bayram ki, ona şeir bəyəndirmək çox müşkül bir məsələ idi. Tanınmış şairlər belə Tofiqə şeir oxumaqdan çəkinərdilər.

İndi istəməsin, Tofiq bizi çox istəyərdi, istedadımıza inandığı üçün həmişə şeir-sənət haqqında söhbət edər, bizi mütaliəyə həvəsləndirərdi. Biz isə maraqla onu dinləyərdik. Redaksiyaya gətirilən şeirləri Tofiq Bayram özü oxuyardı. Səsindən, üzündəki ifadədən yazını bəyənib-bəyənmədiyini o saat hiss edərdik. Tofiq Bayramın səsində çox-çox gözəl şeirlər dinləmişdik o vaxt.

Malik yaşda məndən böyük idi. Bir dəfə necə oldusa Tofiq müəllim mənim Malikdən böyük olduğumu söylədi. Onun sözünə hamımız güldük. Bu mövzuda "Yaşım az olsa da" adlı bir şeir də yazmışdım o vaxt...

Malik çox sakit, təmkinli bir oğlan idi. Şeirlərini oxuyanda adam təəcüblənirdi ki, belə gözəl şeirləri yəni bi sakit, laqeyd cavan yazıb? Ancaq əslində bu sakit oğlanın ürəyində ata itkisinin yanğısı, ilk sevgi oxu daşa dəyən həssas bir cavanın ürək göynərtisi yuva salmışdı...

*Qəribtək boylandım yollara sarı,*
*Sandım ki, arxanca Laçın da köçdü.*
*O saf əllərimin ilk sığalları*
*Qara tellərində, saçında köçdü.*

*Bu gün gəlin köçdün, yollar yuxaldı,*
*Bir çinar göz yaşı tökdü o ki var.*
*Arxanca çırpındı, sonra yox oldu*
*O ilk görüş yeri, o qızartılar...*

*İlk eşqi anaram, elə çağlaram...*
*O ki, bir görünməz əl idi, getdi.*
*Sevdalı günlərim, gözəl çağlarım*
*Vağzalı səsində əridi, getdi...*

Qəribədi, Maliki göynədən o vağzalı səsi indi də mənim qulaqlarımdadı. Qəribəlik bir də ondadı ki, o hadisələrin mərkəzində olan, Laçından şəhərə gəlin aparanların sırasında mən də var idim o vaxtlar...

...Malik bütün dünyaya, kainata doğulduğu Laçın dağlarının gözü ilə baxırdı elə bil. Laçın dağları elə bil ki, onun gözəllik meyarı idi.

*A doğma cığırlar, a Qızıl qaya,*
*Danış o yerlərdə keçən çağımdan, -*
*Tutdunuz əlimdən, qoca dünyaya*
*İlk dəfə boylandım Laçın dağından...*

*Orda boy atdıqca mən yavaş-yavaş*
*Könlümə bir dünya dolurmuş demə.*
*O layla, o muğam, o torpaq, o daş*
*Dönüb Azərbaycan olurmuş demə.*

*A doğma torpağım, mən də bir quşam,*
*Qalıbdır arxanca gözüm mənim də.*
*Bu dağlar qoynunda qanad açmışam,*
*Bu dağlar qoynudur son mənzilim də.*

*Ayrı səmalara baxa bilmirəm,*
*Göylər qaralsa da haray səsimdən.*
*Ha qanad çalsam da çıxa bilmirəm*
*Bu doğma torpağın cazibəsindən...*

“Bu doğma torpağın cazibəsindən çıxa bilməyən” Malik Fərrux “Laçın yallısı”, “Gecənin bir aləmi” şeirində təbiət gözəlliyinə heyrətini obrazlı misralarla əks etdirməyi, “Nəbi qeyrətli, Həcər birçəkli” dağları şairanə bir dillə vəsf etməyi bacarmışdı. O şeirlərin təsbeh dənələri kimi qırılıb yaddaşıma düşən misraları indi də qulaqlarımda səslənib məni xəyalən o yerlərə aparır: “Nəhəng nağaraya döndü qəflətən, Şimşək çubuqlarla döyüldü göylər”; “Ay aman, çiynimdən daş əllər tutub, Deyən, qoşulmuşam yallıya mən də”; “Çəmənlər döşənib ayaqlarıma, Şümşürük oynayır başımın üstə”; “Bir dağ biləyimi elə sıxdı ki, Gözlərim yaşardı, qolum göynədi”; “Düşmüşəm Laçına bu gecə vaxtı, Düşmüşəm illərin yorğunluğundan”...

Aranda gördüyü dağı xəyalən Laçın dağları ilə müqayisə edən şairin düşüncələri də çox maraqlıdır: “Ürəyi yanana bir içim suyun yox-

dursa, ta sənin haran dağ oldu?”; “Barı bir ağac da yetirməmisən, Gələnə, gedənə kölgəlik ola”; “Dağ boyu verincə təbiət sənə, Gərək dağ taleyi bağışlayaydı”... Şeiri oxuduqca adam qəribə duyğular keçirir. Elə bil ki, dağ olmaq arzusu gözündə qalan Aran dağına şairin yazığı, rəhmi gəlir (“Aran dağı”)...

Malikdə Vətən sevgisi, yurd sevgisi böyük idi. Nə yaxşı ki, bu sevgi indi onun “Vətən nəğməsi”, “El havası”, “Bir payız günü”, “Dağların təsbehi”, “Cıdır düzü”, “Qartallı dağlar”, “İlk eşqimin yuvası” və s. şeirlərinə hoparaq bir əbədiyyət qazanıb... Ancaq nə yazıqlar ki, son mənzilini dağların qoynunda görmək istəyən istedadlı şairimizin bu arzusu onun gözündə qaldı...

Malik Fərrux ucaboylu, ilk nəzərdə laqeyd görünən bir insan olsa da, əslində belə deyildi. Malikin öz daxili dünyasını əks etdirən şeirlərində onun bədii portretini tamamlayan cizgilər çoxdur. Bu şeirləri oxuyanda bayram günü aşsız qalıb anasını xatırlayan övladın (“Bayram aşı”), “Balaca bir otaqda övladlarının gülüşünün Yer kürəsini fırlatmasına” əmin olan bəxtiyar atanın, sevgi şeirlərini oxuyanda dərin məhəbbətlə sevsə də istədiyinə qovuşa bilməyən bir gəncin ürəyinin göynərtilərini görürük. “Ad günümün qonaqları” şeiri isə elə bil sadə, təmtəraqsız bir ömür yolu sürən şairin portretinin son akkordlarıdır:

*Bu nədir, yaxına gəlir uşaqlar,*
*Göylər birdən-birə niyə dəyişdi?*
*İlk ayaq izlərim düşən o dağlar*
*Dənizdənmi çıxır, bu necə işdi?*

*Yəqin ad günümə gəlir dağlarım,*
*Dağlar ağır-ağır tərpənir elə...*
*Xəzərin üstündən gəmi dağlarım*
*Gəlir çiçək-çiçək təpələriylə...*

Bu dağlarda keçən uşaqlıq illəri kino lenti kimi lirik qəhrəmanın gözləri önündən gəlib keçir və daxili dünyasında qəribə duyğular oyadır.

Malik Fərrux öz taleyinin şairidi. O heç zaman ürəyinə yatmayan mövzularda əsər yazmayıb. İndi onun Sosialist Əməyi Qəhrəmanı Sərdar İmrəliyevə həsr etdiyi “Torpağın inamı” adlı poemasını oxuyanda xəyal məni yenə uzaq illərə, “Ulduz” jurnalının redaksiyasına aparır. Jurnalın baş redaktoru Əhməd Cəmil cavan şairləri öz kabinetinə çağırıb söhbət eləyir, onları əmək mövzusunda əsərlər yazmağa həvəsləndirirdi. O za-

man Əhməd müəllimin hüzurunda əyləşib onu dinləyənlərin sırasında Malik də, mən də var idik. Bax "Torpağın inamı" poeması da bu söhbətdən sonra yaranmışdı. Ancaq ən maraqlısı bu idi ki, Malik Fərrux quru istehsalat mövzusuna da poetik bir nəfəs, poetik bir ruh gətirə bilmişdi.

Malik Fərruxun ilk və son iş yeri Azərbaycan Dövlət Televiziyası idi. Son görüşümüz də elə bu televiziyanın həyətində olmuşdu. Bir zaman həmin televiziyada şöbə müdiri işləyən bir adam kimi tam əminliklə deyə bilərəm ki, Malikin az şeir yazmasının, az çap olunmasının bir səbəbi də elə bu idi. Günü ayrı-ayrı rayonlarda, kəndlərdə keçirdi. Baməzə söhbətləri dillərdə gəzirdi, ara şeirləri dillərdən düşmürdü...İndi də səhərlər dəniz sahilində gəzişəndə Malikin duzlu lətifələri, həcvləri ilə dostlarımın əhval-ruhiyyəsini qaldırır, onları gözləri yaşaranacan güldürürəm...

Malik Fərruxun cəmi-cümlətanı ikicə kitabçası işıq üzü görüb: "Pəncərədən qızlar baxar" və "Bir payız günü". İlk kitabı 1977-ci ildə çap olunub, son kitabı isə 1985-ci ildə işıq üzü görüb. Birinci kitabda cəmi 14 şeir və bir poema, ikinci kitabda isə vur-tut 33 şeiri çap olunub şairin. Özü də bu şeirlərin bəziləri ikinci kitabda təkrar gedib... Ancaq inanıram ki, Malikin işıq üzü görməyən şeirləri də var. Çox arzu eləyərdim ki, qələm dostum Malik Fərruxun bütün şeirlərini bir kitabda görüm, bir kitabda oxuyum...

Malik Fərruxun tələbə dostlarına həsr elədiyi "Bir günəşin zərrələri" adlı şeirində belə bir bənd var:

*Səssiz boy atırıq hər saat, hər gün,*
*Nə həsəd, nə də ki, qibtəyik hələ.*
*Nə vaxt kəşf olarıq? –*
*Bu dünya üçün*
*Bir sirli-soraqlı qitəyik hələ...*

Malik Fərruxun poeziyası da sirli-sehrli bir qitədir elə bil. Bu qitəni kəşf eləyən yeni nəsil heç nə itirməyəcək, əksinə çox şey qazanacaq. İnanıram ki, Malik Fərruxun səmimi şeirləri onların qəlbində gözəllik duyğusu, həyat eşqi oyadacaq...



**Rafiq YUSİFOĞLU,**
***Azərbaycan Respublikasının***
***Əməkdar Mədəniyyət işçisi,***
***şair, filologiya elmləri doktoru, professor***

**BİZƏ YAZIRLAR**

## "LAÇIN YURDU" JURNALININ REDAKSİYASINA

Çox hörmətli Arif bəy, salam! Jurnalınızla tanış oldum. İşiniz avand olsun. Nizami Gəncəvi yazırdı: "Sözün də uzaqvuran toplar qədər qüdrəti var".

Dərginizin də hədəfi uzaqlaradır. Dünyaya yeni laçınlılar gəlir. Onlar yurdunu tanımalıdır. Həm də nəsillərə sifariş var: "Canımdan keçərəm, torpağımdan yox".

Laçın təkcə laçınlıların deyildi. Bütün aran rayonlarının camaatı buradan bir yaylaq kimi istifadə edirdi. Bol suları, meşəsi, otlağı, çəməni, həm dağı, həm də aranı olan bu yerlər təbiətin bir möcüzəsi idi.

Məni heyran edən o gecələrdən yazmasam olmaz. Elə bil ki, planet nə qədər ulduzu varsa bizim səmaya göndərib. Göy üzü o qədər təmizdir ki, bürclər ayrıca görünür. Qalaktika (süd kimi ağ deməkdir) sanki göy üzündə bir şose yoludur. Zəvvarlar ona Məkkə yolu deyərmiş. Neçə ildir göydə ulduz axtarıram.

Bircə gecə Çalbayırda alaçıqda yatsan, bilərsən ki, bura behiştin özüdür. Sən Lülpər dağında yayın qızmarında su arxının kənarlarının buz bağladığına, buzun altından yarpızın boy göstərməsinə baxasan.

Nərdivan dağına qalxıb, Qızıl Qayaya baxıb deyərsən: İlahi, bu nə büsatdır? Günəş şüaları qayanı qızıl daşa necə çevirir?

İnsanlarımız da dağlarımız kimi əzəmətli, əyilməz, yaltaqlıq bilməyən dürüst insanlar. Elə müdriklər ki, bircə sözünə bütün Laçın ayağa dursun.

İnsanlarımız əməksevər və elm sevən. Laçında bir nəfər savadsız tapmaq olmaz. Cənnət yurdları ilə fəxr edirlər.

İnsana lazım olan hər şey var. Bol oksigen, təbii qida, büllur kimi su.

Bir dəfə Laçından alim dostu üçün səbət balı gətirən gəncə alimin sualı belə olmuşdu: "Bala, siz bu balı yeyəndən sonra niyə uçmursunuz?"

Uçurduq, biz göyün lap yeddinci mərtəbəsində uçurduq. Hər kəs daha rahat yaşamaq üçün gecə-gündüz çalışırdı.

1980-ci ildən sonra Bakıda yaşayan laçınlılardan bir çoxu kəndə döndü. Ata yurdunda nümunəvi şəhər tipli evlər tikdilər. Mətbəxi, hamamı, istiliyi olan evlər. Camaat da bundan ruhlandı. Şəlvədən Salahov Salman, Güləbirddən Abdullayev Kamil, Səbahəddin Eloğlu, Fəracandan İsmayılov Abbasqulu, Seyidlərdən Nağıyev Cəlal və bir çoxları belə nümunələr yaratdılar.

Şəhərə Minkənd suyu çatmaqda idi, düzü-dünya su turbaları ilə dolu qaldı.

İnsanlarımız çox xoşbəxt idi. Qadınlarımız əl hanasında xalı, kilim toxumaqda yarışa girirdi. Hamı evinə xarici mebel alırdı.

Erməni isə pusquda girəvə gözləyir. Paxıllıq onun təbiətindədir.

"Qobusnamə"də (XII əsr) oxuyuruq: "Ermənilər riyakar, ürəyi xıltlı, ağasına çox etibarsız insanlardır." İsveçrə şərqşünası Adam Mets isə yazırdı: "Ermənilər ağdərili qulların ən pisidir. Onlar dəyənək və qorxu altında yaxşı işləyərlər".

Nümunə göz önündə. Qarabağın çörəyi ilə böyüyən Sərkisyan Xocalı qətliamındakı iştirakı ilə fəxr edir. Biz köçkünlər onu "qalib görkəmində" görəndə ölüb dirilirik.

Onlar qonaq getdikləri yerdə də kilsə tikirlər ki, tarixə şahidlik etsinlər. Alban kilsəsini də özünün hesab edir. Amma qoca tarix çox gizlinləri aşkar edib.

Şəhərdə möhtəşəm bir məktəb (2 №li orta məktəb) tikilmişdi. Onun bünövrəsi qazılanda üç qat qəbir çıxdı. Yəni üç dəfə bu torpaq əldən-ələ keçmişdi. Əlbəttə, bir gün də sizlər ermənini qovub yurdunuza sahib olacaqsınız.

Hörmətli Arif bəy, ürəyim dolu olsa da, sistemsiz bir yazı yazdım. Eləcə arxivinizdə saxlayın.

El köçüb, oba qalan günlərim idi. Qəzetlərin birində İlham Qəhrəmanın keçmiş müəlliminə təsəlli bir şeiri çıxmışdı. Ona sağ ol deyirəm. Atam Baxışzadə Həsənalı haqqında bir yazı göndərirəm.



Çox istərdim dərginizə maddi kömək edim. Amma burda mənim tuti dilim lal olur.

**Şəfiqə BAXIŞOVA,**
***"Şərəf Nişanı" ordenli müəllim,***
***Qabaqcıl Maarif Xadimi***

**P.S.** Narahat olmayın, Şəfiqə xanım. Dərgimizə maddi kömək edənlər də tapılacaq. Bizə sizin kimi ağbirçəklərin, ziyalıların mənəvi dəstəyi daha vacibdir.

**AXTAR BABALARI…**

## BAXIŞZADƏ HƏSƏNALI BAXIŞ OĞLU



Atam 1898-ci ildə Zəngəzur mahalının Fəracan kəndində anadan olmuşdur. İlk təhsilini Qubadlı rayonunun Mollu kəndindəki molla məktəbində almışdır. Atam çox baməzə adam idi. Bir dəfə kənd mollası Zülfüqar kişidən soruşdu: Ay Zülfüqar, ikimiz də eyni molladan dərs aldıq. Bəs niyə sən molla oldun, mən yox. O da hazırcavab imiş. Dedi: Elə müəllim də molla deməkdir.

1918-19-cu il erməni-müsəlman davasında bütün el kənddən çıxır. Atam da yenicə evləndiyi xanımını götürüb Şimali Qafqazda yaşayan Rza bəyə pənah aparır. Bir neçə ildən sonra Bakının Bülbülə qəsəbəsində yaşayan qardaşlarının yanına gəlir. Ramana neft mədənlərində çilingər kimi çalışır. N.Nərimanovu, Ə.Topçubaşovu yaxından tanıyır. Onların haqqında çoxlu xatirələri var idi.

1932-ci ildə kəndlərdə kollektivləşmə ilə bağlı atamı Laçın rayonuna torpaq şöbəsinin müdiri göndərirlər. Çətin illər idi, yoxsullar kollektivləşməni qəbul edir, varlılar qəbul etmirdi.

Atamın camaatla çox səmimi rəftarı olmuşdu. Ona görə də kənd camaatı onu “atamoğlu” çağırırmış.

1937-ci ilin quru günləri gəlir. İnsanlar bir-birinə qənim kəsilir. Bir-birindən “danos” yazır. Zaman o zaman idi ki, qohum da qohumu bada verməyə hazır idi.

Rayonun birinci katibi Teymur Salahov bir neçə tanınmış adamla birlikdə atamın da onun “şəbəkəsində” olduğunu boynuna alır. Almır, sadəcə zorla boynuna qoyurlar. Bu barədə mərhum Ziya Bünyadovun “Qırmızı terror” kitabında da məlumat var.

18 ay atam mühakiməsiz, sübutsuz Şuşa türməsində yatır. Nəhayət, məhkəmədə bütün deyilənlər inkar edilir, atam bəraət alır.

Öz ata yurdu Aşağı Fəracan kəndinə məktəb direktoru göndərilir.

Atam kəndin həm müəllimi, həm həkimi, həm də mühəndisi, ustası olur.

Şimali Qafqazda gördüklərini kənddə tətbiq edir. Odunla qızdırılan hamam qurur. Kəndimizdə qazıntı zamanı yerin lap dərin qatından nəhəng küplər, duş vannalar çıxırdı. Bu da təsdiq edirdi ki, bu yerlərdə

qədimdə albanlar yaşamış, üzümçülüklə, şərabçılıqla məşğul olmuşlar. Atam evdə xüsusi səliqə-səhman yaratmışdı. Balaca bir guşədə apteki var idi. Rayon mərkəzinə getdikcə camaata lazım olan dərmanları alar, insanlara təmənnasız yardım edərdi. Məktəbin bütün işini, təmirini özü edərdi.

1940-cı ildə atamı Laçın rayon Xalq Maarif Şöbəsinə müdir gətirirlər. 1941-ci ildə müharibə başlayanda hamının keçmişinə əl gəzdirdilər. 1937-ci il repressiyası yenidən yada düşdü, atamı ərizəsi ilə 1942-ci ildə işdən azad etdilər və Mığıdərə kənd orta məktəbinə direktor göndərdilər. Atam qiyabi yolla ali təhsil də almışdı.

Bir neçə ildən sonra onu yenə öz doğma kəndinə məktəb direktoru təyin edirlər, ömrünün sonuna qədər orada çalışır.

O, respublika əhəmiyyətli fərdi təqaüdçü idi, "Əməkdar müəllim" fəxri adına layiq görülmüşdü.

Mənsub olduğu kommunist partiyası onu dönə-dönə incitsə də, ideya və əqidəsində sədaqətli idi.

Sovet hökumətinin son illərini, deformasiyaları görəndə dizinə döyər və deyərdi: "Özümüz qurduğumuzu özümüz də yıxmalıyıq".

Ruhun şad olsun, ata, biz onu yıxdıq.

Atam vəfat edəndə Rayon İcraiyyə Komitəsinin sədri Tofiq Nəcəfov icazə alıb evimizə baxdı və dedi: Beləları bir neçə nəfərdir.

Yəni var-dövlət hərisi olmayıb belə sadə həyat yaşamaq hər kişinin işi deyil.

Mən də nəvələrimə deyirəm: Yolunuz o yerlərə düşəndə yaşı min illərlə ölçülən "Babalı qəbiristanlığı"nda (məzar daşı əgər qalıbsa) üstündə günəş şüaları bərq vuran bir qəbir görsəniz bilin ki, o sizin babanız Baxışzadə Həsənalıdır. Sizlər sağ olun!

**AXTAR BABALARI...**

## MEŞƏBƏYİ GÜLMALI



Özünü insan adlandıran hər bir kəs - elita nümayəndələri, ictimai xadimlər və el ağsaqqalları, sadə əmək adamları, torpağa sevgisi olan hər bir kəs Vətənə olan məhəbbətini sözlə yox, əməli fəaliyyəti ilə həyata keçirməlidir.

Azərbaycanın Laçın bölgəsində yaşayan adamların bir çoxunun taleyi və hətta tərcümeyihalları bir-birinə bənzəyir. Onların hər biri bu bölgədə, bu və ya digər kəndin birində anadan olmuş, kənddə böyümüş, həddi-buluğa çatmış, sonra isə ilk əmək həyatına bu kəndlərin birindən başlamışlar.

Sizə belə insanlardan biri olan Gülmalı kişidən söhbət açmaq istərdim. El-obada, camaat arasında Meşəbəyi Gülmalı (70-ci illərin yaşlı nəslinin dili ilə desək, “Abeşiy Gülmalı”) kimi tanınardı. Onun taleyi və əmək yolu quruluşda bir çoxlarının həyat yolu ilə eyni olsa da, bir çox cəhətləri ilə digərlərindən fərqlənirdi.

Hümbətov Gülmalı Qasım oğlu 1926-cı ildə Şamkənd sovetliyinin Ələkçi kəndində dünyaya göz açmışdır. Dünyaya gəldiyi Ələkçi kəndinin füsünkar təbiəti, axar-baxarlı Çilgəzçay, ağ örpəkli Qırxqız yaylağı hələ uşaq ikən onu valeh etmiş, təbiətə vurğunluğunu birə on artırmışdı. Bəlkə də bu səbəbdən o, sonda meşəbəyi peşəsinə yiyələndi.

1952-ci il yanvarın 23-də Azərbaycan Taxta Emalı Sənayesi Laçın Meşə Təsərrüfatı İdarəsinin nəzdindəki Hacısamlı Taxta Emalı Zavodunda Kürdhacı Meşə Hazırlığı sahəsində ağac emalı üzrə fəhlə kimi işə başlamışdı. İşə başladığı dövrdən əzmlə çalışmış, verilən bütün tapşırıq və işləri layiqincə yerinə yetirmişdi.

Bir müddət işlədikdən sonra ümumi kollektivin hörmətini qazandı. Onun əmək kitabçasında 1955-ci il 26 avqust tarixli əmrdən oxuyuruq: “Kürdhacı Meşə Hazırlığı sahəsində ağac emalı üzrə fəhlə vəzifəsində işləyərkən göstərilən etimadı doğrultduğu üçün Hacısamlı meşəçiliyinin zavod obxodunda kiçik meşə gözətçisi təyin edilsin.” Bir az sonra isə Meşə gözətçisi (meşəbəyi) vəzifəsinə təyin edilən Gülmalı kişinin işçilər arasında hörməti daha da artdı.

Ömür-gününü sanki məşhur bir rəssamın fırçasından yaranmış dağlarda, təmiz havada, yaşıl donlu meşələrdə, sərin bulaqların başında ke-

çirən Meşəbəyi Gülmalı çox sağlam və gümrah idi. Yaşadığı el-obanın bənd-bərəsinə, hər cığırına, hər ağacına bələd idi.

Kəndimizdə və ətraf kəndlərdə elə bir adam tapılmazdı ki, Meşəbəyi Gülmalı onlara az-çox yaxşılıq etməsin. Kasıb-kusubun tərəfdarı idi. İmkansız ailələrə əl uzadardı. “Odun pulu”, bəzən də el arasında “tüstü pulu” adlanan yanacaq pulunun toplanması zamanı imkansız ailələri müxtəlif yollarla bu siyahıdan uzaqlaşdırardı.

Meşəbəyi Gülmalı həmişə “Qarabağ atı” saxlamağı xoşlayardı. Altındakı “Kürən at”ı tumarlı və gümrah saxlardı. Harada olmasından asılı olmayaraq ilk öncə atın otuna, arpasına diqqət yetirdikdən sonra özü rahatlanardı. Bunun səbəbini soruşanda “Atı qamçı aparmaz, arpa aparar” söyləyərdi.

Müxtəlif vaxtlarda “Laçın” qəzetində bu sadə əmək adamı haqqında məqalələr dərc olunmuşdur. Azərbaycan SSR Ali Sovetinin Rəyasət Heyətinin qərarı ilə 1988-ci il 31 mart tarixdə Hümbətov Gülmalı Qasım oğlu “Əmək Veteranı” medalı ilə təltif edilmişdir.

Az-çox kəndimizlə tanışlığı olan hər kəs Meşəbəyi Gülmalını yaxşı tanıyırdı. Kürən atın üstündə, ağır təbiətli, eşmə bığlı, qürurlu və məğrur duruşlu, sərt baxışlı, çiynində silah, döşündə fotoaparat, əlində “tatar”ı qamçı olan Meşəbəyi Gülmalı bu gün də həmyerlilərimiz tərəfindən xoş xatirələrlə xatırlanır. Hər bir insanın keçdiyi ömür yolunda heç vaxt unudulmayan və həmişə şirin xatirələrlə yada düşən əhvalatlar olur. Belə əhvalatlar Meşəbəyi Gülmalının həyatında da çox olmuşdur. Hətta onun adına şeir yazılmış, mahnı oxunmuşdur. Kəndlərdə toy mərasimində bu mahnı oxunar, Gülmalı kişi özü də bu mahnının sədaları altında rəqsə dəvət olunardı. Mahnının sözlərini (şeiri) həmin vaxtlar Kürdhacı kənd orta məktəbində direktor işləyən Hüsü müəllim (Hüsüyev Hüsü Məhəmməd oğlu) yazmışdı. Bu şeiri ətraf kəndlər də daxil olmaqla böyükdən kiçiyə hər bir kəs əzbər bilirdi:

*Çiçək açar zoğal, püstə,*
*Bənövşədən tutar dəstə.*
*Kabab üçün bulaq üstə*
*Tonqal çatar, a Gülmalı.*

*Bığı burma, enli kürək,*
*Sən Bulusa qurma kələk.*
*Danalara bəs nə verək? -*
*İtər, batar, a Gülmalı.*

*Bığlarını eşə-eşə,*
*Sinə gərdin keşməkeşə.*
*Hənirtindən çəmən-meşə*
*Qalxıb-yatar, a Gülmalı.*

*Altındakı kürən atla,*
*Döşündəki aparatla.*
*Çiynindəki o sürsatla*
*Beldə qatar, a Gülmalı.*

*Yaşıl çəmən yaylağındır,*
*Meşə, tala oylağındır.*
*Dağ-dərələr ovlağındır,*
*Əldə tatar, a Gülmalı.*

*Sən qanunu gözləyənsən,*
*Meşə qıran izləyənsən.*
*Hər yetənlə gəzməyəsən,*
*Səni satar, a Gülmalı.*

*Dilə gəlib tarla kaman,*
*Elim-günüm sənə qurban.*
*Yoldaşlıqdan qoca zaman*
*Səni atar, a Gülmalı.*

Meşəbəyi Gülmalı iş yerində və iş yoldaşları arasında həqiqətən çox böyük hörmət qazanmış adam idi. Zahiri formasından fərqli olaraq xarakterindəki sadəliyini, ürəyigenişliyini, uzaqgörənliyini, xoşxasiyyətliliyini, nikbinliyini görmək üçün onunla az bir müddət yol yoldaşı olmaq kifayət edərdi.

1992-ci ilin 18 mayı – bizim hər birimizin heç zaman unuda bilməyəcəyi bu gün bütün laçınlıların taleyinə qara bir gün kimi yazıldı. Öz doğma yurd-yuvasından didərgin düşmüş Gülmalı kişi ailəsi ilə müvəqqəti olaraq Məcburi Köçkün (ada bax ilahi!) kimi Bakıda, Biləcəri qəsəbəsində məskunlaşdı. Qutu evlər, cansıxıcı otaqlar, dar küçələr onu sıxdı.

Məcburi köçkünlük həyatı yaşayan el ağsaqqalı yurd-yuvadan didərgin düşdüyü gündən ömrünün son anlarına qədər yuxusuzluqdan şikayət edərdi. Səbəbini soruşanda isə deyərdi: “Gecələr yuxum ərşə çəkilir. Gözümü yuman kimi yuxu məni buradan xeyli uzaqlara, tənhalıqlar qoynuna atan fikirlərlə yuxular aləmində yer-yurd, oba axtarışına çıxarır. Mən yuxuda doğma olan el-obanı qarış-qarış gəzirəm. Bu yuxusuzluq xəstəlikdən deyil. Eh!... Yüz loğman neyləsin bir fələk qarğımışa... Kaş dizimin qüvvətli vaxtı olaydı.”

Ürəyi Vətən, torpaq məhəbbəti ilə çırpınan, qəlbi yurd həsrətli, vətənə dönəcəyi günü həsrətlə gözləyən Meşəbəyi Gülmalı 2011-ci il may ayının 12-də, bir bahar günündə Bakı şəhəri, Binəqədi rayonunun Biləcəri qəsəbəsində gözlərini əbədi olaraq yumdu, həmin qəsəbədə də dəfn edildi. Başqalarına nümunə göstəriləcək qədər bir həyat yolu keçmiş bir insan ömrü dayandı. “Tale yazısı” adlı yazıdansa qaçmaq mümkün deyil.

Həyatdan köçmüş adamlar üçün deyirlər ki, adam var evdən gedir, adam var eldən gedir. Mən deyərdim ki, Meşəbəyi Gülmalı və onun kimi bir çox el ağsaqqallarımız el-obadan getdi. Belə insanları sadəcə unutmaq, üstündən adicə hisslərlə ötüb keçmək düzgün olmazdı. Onların hər biri bizim yazılmamış canlı tariximiz, keçmiş yaddaşımız idi. Bu gün həyatda yaşlı nəslin belə nümayəndələrini çıraqla axtaracaq bir vəziyyətdəyik.

Təəssüflər olsun ki, həyatı qədər çox sevdiyi obaya, yurda qayıtmaq sevincini yaşamaq Meşəbəyi Gülmalıya nəsib olmadı. Öz görkəmi, duruşu ilə xatirimizdən silinməyəcək. Allah ona qəni-qəni rəhmət eləsin!

**Sultan HÜMBƏTOV**

**BİZƏ YAZIRLAR**

## Salam hörmətli Arif müəllim və “Laçın yurdu” dərgisinin kollektivi!

Əvvəla, bu dərginin təşəbbüskarı və yaradıcısı olduğunuz üçün sizlərə səmimi minnətdarlığımı bildirirəm. Açığını deyim ki, bu jurnalı ilk dəfə görəndə hansı hissləri keçirdiyimi sözlə heç cür təsvir edə bilmərəm. Onu bilirəm ki, bu hisslər sevinclə kədərin, ümidsizliklə ümidin, yaşanan ömürlə xatirənin... vəhdəti idi. Biz, onsuz da odu söndürülüb, külü ilə oynayanlardanıq! Amma hələ ki, bu kül var və hərarətlidir, bu külü qoruyub saxlamaq da hünərli insanların həyat amalıdır. Mən bəlkə də ümidsiz, çox realist adamam, amma Allahın da möcüzəsi çoxdur... Tanrı bizləri Vətənə qovuşdursun, inşallah!

Böyük inamla deyə bilərəm ki, bu jurnal mənim kimi, hər bir Vətən, yurd təəssübkeşi olan insanın stolüstü kitabı olacaq və laçınlılığımızın yaşadılmasında müstəsna əhəmiyyət kəsb edəcəkdir. Bu yolda sizlərə uğurlar diləyirəm, Yaradan sizlərə yar olsun, sizi qorusun deyirəm!

Mən şair deyiləm, amma ən adi laçınlı kimi, bəzən öz hisslərimi kağıza köçürə bilirəm. Bu, bizim dərdlərimizin səsidir, ruhumuzun iniltisidir.

Bu yazılardan bir neçəsini də sizə göndərirəm. Məsləhət bilsəniz, dərginizdə işıqlandırarsınız. Özüm haqda bir neçə məlumatı da yazıram: Mən, Zamanov Namiq Zaman oğlu (qısacası NAMİQ ZAMAN) 1971-ci ildə Laçın rayonu, Qorçu oymağının Zağaaltı kəndində anadan olmuşam. 1994-cü ildə ADPU-nun kimya-biologiya fakültəsini bitirmişəm. Hal-hazırda Ağdaş rayonunun Xosrov kəndində “yaşayıram” və həmin kənddə ixtisasım üzrə müəllim işləyirəm. Ailəliyəm, iki övladım var.

Şeirlərim və yazılarım “Azad press”, “Mingəçevir”, “Laçın”, “Ədalət” , “Sosial xəbər”, “Kredo”, “Yeni Azərbaycan” qəzetlərində, “Ulduz”, “Azərbaycan”, “Mingəçevir leysanı” jurnallarında, “DGTYB”-nin və “Kultaz.com”-un internet saytlarında dərc olunub.



***Hörmətlə*:Namiq ZAMAN**

E-mail: namiq.zaman@box.az,
namiq.zaman@mail.ru

## NƏ SÖZÜM...

Mən nə deyim...Həyat yaman həyatdı;
Şirininə, acısına nə sözüm...
İnsanı ki, Tanrı özü yaratdı –
Alçağına, ucasına nə sözüm!..

Minnət ilə ömür sürmək çox çətin,
Vaxt olar ki, sonu çatar zillətin.
Ömrü boyu tapdaq olan millətin
Cavanına, qocasına nə sözüm...

Məmləkətin işi haqqa qaldısa...
Qız-gəlini ona-buna quldusa,
"Rəhmət"inə təmənnası puldusa,
Mollasına, hacısına nə sözüm...

Qarət üçün əldə silah tutanın,
Başdan-başa günahlara batanın,
Vətənini, millətini satanın
Anasına, bacısına nə sözüm!..

## BİR GÜN GƏLƏCƏYƏM ZİYARƏTİNƏ

Vətən, ey müqəddəs ana laylası,
Cismimin, canımın kökü, mayası.
Ehey!.. Gözlə məni, Laçın qayası,
Bir gün gələcəyəm ziyarətinə.

Sevgisi duyğumu "oda salası",
Ölsəm, kimliyimi yada salası.
Ey bir ovuc torpaq – mənim olası,
Bir gün gələcəyəm ziyarətinə.

Ey cənnət məkanım – meşə talası,
Ey qaya kəkliyim, sular sonası.
Sən ey al libaslı dağlar lalası,
Bir gün gələcəyəm ziyarətinə.

Nankor övladların – başın bəlası...
Daha kim qaldı ki, könlün alası?!.
Ey məğrur, ey uca "Sultan qalası",
Bir gün gələcəyəm ziyarətinə.

Ədalət nə zaman zəfər çalası,
Namiq intizarda çoxmu qalası?!.
Ey zirvələr şahı – qartal balası,
Bir gün gələcəyəm ziyarətinə,
Əlbət gələcəyəm ziyarətinə!..

## GƏLMİŞƏM

*(Bu gecə yuxumda yenə də Vətənə qovuşmuşdum...)*

Gözəl Vətən, sıxıb səni köksümə,
Boynuna qol dolamağa gəlmişəm.
Şad eyləyib babaların ruhunu,
Ocaqları qalamağa gəlmişəm.

Haraylayıb perik düşən elini,
Əllərindən ta üzmərəm əlimi.
Xəzan olmuş çəmənini, çölünü
Göz yaşımla sulamağa gəlmişəm.

Niyyət tutub muradıma yetməyə,
İlham alıb həzin-həzin ötməyə,
Daşlarını qucaqlayıb öpməyə,
Torpağını yalamağa gəlmişəm,
Göz yaşımla sulamağa gəlmişəm!..

**DƏRC OLUNANLARA QAYIDIRIQ**

## "YAXŞI OXUYURSAN, AMMA…"

***Bu da İlyasın sözüdür, ona məxsus yüzlərlə lakonik deyimlərdən biri! Öz ağzından çıxan ifadədir, yadda qalıb, indi "işə salır, ortaya qoyuruq". Əti, qanı elə bil yumorla, dərin mənalı, incə mətləb aşılayan kəlamlardan, ibrətamiz tənqidi hikmətlərdən yoğrulmuşdu İlyasın! Buna ruslar sadəcə olaraq "yumoreska", ironiya deyir, bizlərdə "atmaca", "eyham" sözləri uyğun gəlir. Hər atmacasının arxasında bir mənalı deyim, lətifə, zərb-məsəl xarakterli süjet dayanırdı dostumuzun! Nə vaxtsa hamımızı şaqqanaq çəkib gülməyə "vadar edən" bu söz və ifadələrdən birini bilərəkdən önə çıxarmış, başlıq seçmiş, sərlövhə etmişik. Niyə? Biləcəksiniz, bir balaca hövsələ göstərin...***

### Xatirə-qeydlərə giriş

Oxucuya təqdim edilən bu qeydlərin tarixçəsi neçə-neçə onilliklər bundan əvvələ gedib çıxır. Dəfələrlə götür-qoy edib müxtəlif variantlarda "eskiz" çıxarmışam, təkcə onu ağ kağıza köçürməkdə tərəddüd göstərmişəm. "Təxirəsalmaların" yeganə səbəbi adi məqam, "bir münasibətin" tapılmaması olub.

Yaxın vaxtlarda nəşrə başlamış "Laçın yurdu" dərgisinin ilk nömrəsi əlimə düşdü. Oxuyub tanış oldum. Məqsəd və məramı aydın idi. Əsas "vurğu", "ağırlıq mərkəzi" Laçın mənşəli şəxsiyyətlərə, təbiətin bu dilbər guşəsində doğulub boya-başa çatmış adamlara yönəldilmişdi. Özözümə: – Bu da "məqam", – deyib iç dünyamda yığılıb qalmış xatirələri yazıya köçürdüm. Beləliklə, keçmiş tələbə dostumuz, gözəl insan, incə ruhlu şair, şən və hazırcavab, duzlu, məzəli söhbətləri ilə hamımızın qəlbinə yol tapmış dəyərli ziyalı İlyas Cavad oğlu İbrahimov barəsində xatirə-qeydlər "ərsəyə çatdı".

Dərginin təsisçisi və baş redaktoru Arif Məmmədli təklifimizi bəyəndi və məsləhət gördü ki, bir az gözləyək: – Növbəti nömrəyə tanınmış jurnalist Şöhlət Abbasın bu mövzuda yazısını, şairin bir neçə şeirini planlaşdırmışıq, – dedi.

Dərginin yeni nömrəsi vaxtında çıxdı. "Ədəbi irsimizdən" rubrikası ilə verilmiş "Şeirlərə köçən ömür" yazısını dönə-dönə oxudum. Şöhlət müəllim İlyasın şeir dünyasına nəzər salır, onun istedadı, qabiliyyəti, ona olan el sevgisi barədə ətraflı söhbət açırdı. Dərgidə şairin "Qızım Təranəyə" və "İki məktub" şeirləri də verilmişdir. Dünyadan vaxtsız köçən qeyrətli oğulu, gözəl şairi yada saldığına görə Şöhlət müəllimə çox sağ ol deyirəm.

Xatirə – qeydlər eyni mövzunun davamı olduğu üçün onu “Dərc olunanlara qayıdırıq” rubrikası ilə “Laçın yurdu”nun redaksiyasına təqdim etdim.



**Tanışlıq**

Əslində bu anlayış nisbidir. Düzünə qalsa, ötən əsrin ortalarında Bakının o isti yay günlərində qəbula gələn abituriyentlər arasında tanışlıq yox dərəcəsində idi. Bir imtahanda tanış olduğun uşaq əksər hallarda növbəti imtahana gəlib çıxmırdı, “qeyri-kafi” alıb geri qayıdırdı. Rus dilindən yazılı və şifahi imtahanlar isə əksər hallarda elə bil istedadlı uşaqların “qəsdinə durmuşdu”.

Ötəri “tanışlığım” rus dilindən şifahi imtahanda oldu. Bilet çəkmişdik. Bir oğlan suallara cavab verirdi. Biz outrub hazırlaşırdıq. Nigarançılığım yox idi, “diktantdan” “əla” almışdım. Yanaşı partadan qaraqaş, qaragöz oğlan imtahan biletini mənə tərəf sürüşdürüb barmağını bir sualın üzərində saxladı. İstəyini başa düşdüm. İki-üç kəlmə pıçıldamışdım ki, gur saçlarını səliqə ilə rəngləyib daramış (onda saça briolin sürtmək dəbdə idi) müəllim (sonra bildik ki, kafedra müdiri Yutkin imiş) amiranə: “farağat otur” komandası verdi. Növbə mənə çatanda açıq-aşkar qiymətimi bir bal aşağı saldı. Komissiya üzvlərindən orta yaşlı qadının: – Narahat olma, bala, sənin qiymətlərin yüksəkdir, artıq tələbəsən, – deməsi məni haqlı etiraz və mübahisədən çəkindirdi...

Avqustun sonu idi. İnstitutun Bakıxanov (onda Nijni bulvar adlanırdı) küçəsindəki yataqxanada yer alırdıq. Həmin cavan oğlanı gördüm, sevincək təbrik etdim. Bu, Laçından gəlmiş İlyas idi.

İçimizdə 6-7 nəfər yaşlı tələbə var idi. İlyas da daxil olmaqla 4 “veterana” bir otaqda yer vermişdilər (sonra onlardan 2 elmlər doktoru, 1 elmlər namizədi yetişdi). Biz 8-9 nəfərlik otağa düşdük, yuxarı mərtəbəsi “Oxu zalı” idi. Yataqxanada hər cür uyğunluğa malik yeməkxana olsa da, bir çoxumuz “mətbəxin xidmətindən” istifadə edirdik. “Veteranlar” qərara gəlmişdilər ki, gündə bir nəfər növbətçi dayanıb xörək bişirsin. Zarafatcıl, hazırcavab İlyas bu dəmdə də dilini dinc saxlamırdı: – Kişi, – deyirdi, – belə olmaz axı, filankəsin “dejurna vaxtı” az qala tavadan ət çıxmır. – Bəs hara gedir? – “Dejurnanın qarnına”: Birində dadına baxır, birində duzuna. Birində də bişmiş, ya çiy olmasını nəzərdən keçirir, axırda da qalır kartofla su. O da bəsindir, – deyib, gülüşürdük.

Bu deyimlər, məzəli gülüşlər elə bil bütün tələbəlik dövrü üçün İlyasın atmaca və zarafatlarının başlanğıcı oldu. Kursumuzda o, yeganə tələbə idi ki, təxminən hamı ona “rəm atır”, söz deyir, cavabını da əlüstü alıb düşürdü “mat vəziyyətinə”. Bu “şənlik” aləmində bir nəfər də olsa ondan incimədi.

**Günlər ötüb il olur...**

Bakıya, qaynar tələbəlik həyatına “uyğunlaşma” çox çəkmədi. Hər şey qaydasına düşmüşdü. Dərslərə davam edir, elmin əsaslarına yiyələnmək üçün gecəli-gündüzlü çalışırdıq.

Möhkəm intizam var idi. Ayrı-ayrı fənlər üzrə tapşırılmış əlavə ədəbiyyatı oxuyub çatdırmaq çox vaxt aparırdı. Kitab çatışmırdı, azlıq edirdi. Yadımdadır, xarici ölkələr ədəbiyyatından V.Hüqonun “Səfillər” romanını latın qrafikasında 1932-1936-cı illər çapından tapıb “kollektiv qaydada” oxuduq. Tələbə yoldaşımız Əjdər (indi professor Əjdər Ağayev) “latını” sürətlə oxuyurdu, biz də yığışıb birlikdə qulaq asıb, qeydlər götürürdük. Təsəllimiz də bu olurdu ki, tapşırığı yerinə yetirmişik, İsmayıl müəllimin yanında üzüqara olmarıq. Belə məsuliyyətin ikinci bir səbəbi də o idi ki, hər hansı semestrdə yalnız bir “kafi” qiymət alsan, 6 aylıq təqaüddən kənarda qalardın. Təqaüd isə həyat üçün çox vacib vasitə idi, evdən gələn cüzi bir “əlavə” ilə tələbə bir ay dolana bilirdi...

Axşamlar, boş vaxtlarda yenə maraqlı söz-söhbət canlanır, “hədislər” bir-birini əvəz edirdi. Uşaqlardan hansısa İlyasdan xahiş etdi ki, maraqlı bir epizod danışsın. Elə bil cibində imiş kimi: “Baş üstə”, – deyib sözə başladı:

– Bir yaz günü, el yaylağa gedəndə baş verib bu əhvalat. Oğul-uşaq arabalara dolub deyə-gülə yola davam edir. Arxada qaramal naxırı, at-ilxı, dalınca qoyun-quzu sürüləri səs-küy ilə yal-yamacdan keçib dağa çıxırdı. Kişilər, cavanlar gah inək-buzovu, gah da qoyunları haraylayıb “məsafəni qısaldırdılar”. Kiçik çayın üstündəki körpüyə yaxınlaşanda qarşıdan üç atlı çıxır. Onlardan biri soruşur ki, bu hansı təsərrüfatın köçüdür? Ağsaqqallar macal tapmamış orta yaşlı qadın başını qaldırıb: – Erə başıqa dörüm, Roçur royorurun Voroşirov korxozurun, – deyir.

Atlılar dodaqaltı gülümsünüb uzaqlaşırlar. Bu dəmdə dəstədəki yaşlı kişilər düşürlər qadının üstünə: – Ay səni ölləsən, dilinə qıyıq keçsin, burada bir başıpapaqlı yox idi ki, cavab versin, nə düşürsən meydana, yaman da danışığın var?! – deyirlər.

Sonralar bu epizod "hədis danışmaq", lətifə demək üçün bir siqnala çevrilmişdi. Yeri düşəndə soruşardıq: Ay Voroşilov kolxozunun vətəndaşı, yeni nəyin var, xırdala görək.

Bir axşam Cəbrayıl rayonundan olan dərs əlaçısı Xalid Hüseynov yataqxanaya gəlmişdi. O, şəhərdə qardaşıgildə yaşayırdı. İlyasın tarı "meydan aldı" (o saz da çalırdı). Oxumaqda elə bir səriştəsi olmasa da, Xalid əvvəl zümzümə etdi, sonra başladı oxumağa. İlyas "sürəti" artırdı. Xalid onu başladı "izləməyə" və tar çalan göz-qaşla onu başa saldı ki, oxu, alınır... Beləcə "tarzən-xanəndə" dueti xeyli uzandı. İlyas çalmağı dayandırıb mizrabı yerinə qoydu və döndü qonağa tərəf: Yaxşı oxuyursan, Xalid, amma bir qüsurun var, onu düzəltsən, daha sənə zaval yoxdur. Müsahibi cavab verdi ki, düzəldərəm, de. Hamının maraqla qulaq asdığını görən İlyas Xalidin qulağına tərəf əyilib pıçıldayırmış kimi ucadan dedi: Səsin yoxdur!

Gülüş otağı başına götürdü. Bu epizod da sonralar tələbələr arasında zərb-məsələ çevrilmişdi: "Yaxşı oxuyursan, amma..."

## Bizimki gətirmişdi və ya<br>hər biri bir dünya müəllimlərimiz

Bu sözlərdə böyük bir həqiqət var, mübaliğədən uzaq bir həqiqət! Bizim dil-ədəbiyyat fakültəsi uşaqlarının birinci "seçimi" İsmayıl Şıxlı – Abasqulu Məhərrəmov cütlüyünün tələbkar "normalarına" əsaslanırdı. İxtisasdan qəbul imtahanlarını onlar götürmüşdülər. Digər fənlər üzrə də seçim uğurlu keçmişdi. Nəticədə 50 nəfərlik çalışqan, intizamlı, intellektual bir "özək" təşlik olunmuşdu. Aradan 20 il keçəcək, müəllimlərdən biri yubiley tədbirində söz alıb o günləri xatırlayaraq etiraf edəcək: Bu məzunlar institutun tarixində ən yaxşı, ən uğurlu buraxılışdır!

Bəli, bizimki həqiqətən gətirmişdi. Ona görə ki, bizə İttifaq və respublika miqyasında geniş tanınmış müəllimlər dərs deyirdi. İnamla qeyd etmək olar ki, onların hər biri öz savadı, dünyagörüşü, mənəvi-əxlaqi keyfiyyətləri ilə sayılan-seçilən mütəxəssislər, ziyalılar idi, qısası, hər biri bir aləm, bir dünya idi. Bəzilərinin mühazirəsini dinləmək üçün qonşu fakültə və kurslardan da bizə qatılmağa can atanlar olurdu.

Bir gün icazə alıb həkimə getmişdim. Dərsə çata bilmədim. Professor M.Rəfili ədəbiyyatşünaslığa girişdən əruz vəznini keçməliydi. Axşam uşaqlar yataqxanaya qayıtdı – Hə, gün necə keçdi, mənsiz darıxmadın ki, – deyə İlyasa müraciət etdim. Təəssüf hissi keçirdi, – gərək gələydin, Əsgər, çox şey itirdin, – deyib davam etdi:

– Zəng yenicə vurulmuşdu. Bir də gördük ki, professor Mikayıl Rəfili, yanında da Əkrəm Cəfər (o da bizə dərs deyirdi) girdilər auditoriyaya. Professor bildirdi ki, mövzu aydındır, ötən dəfə elan etmişdim. Bu dərsi keçməyi Əkrəm müəllimə xahiş etmişəm. O, əruzun ən yaxşı ustasıdır. Elə bilirəm ki, razı qalacaqsınız, – deyib qabaq partada əyləşdi.

Əkrəm müəllim böyük maraqla əruz, onun tarixi, xüsusiyyətləri, bəhrləri, onları fərqləndirən cəhətlər barədə öz şirin İsmayıllı ləhcəsində çox müfəssəl mühazirə oxudu. Hamımız heyran olmuşduq. Professor özü də bir qoşa saatı diqqətlə dinlədi. Halbuki bu nəcib hərəkətin təşəbbüskarı olan professor İttifaqda tanınmış alim idi, ədəbi proseslərin gözəl bilicisi idi, "Ədəbiyyat nəzəriyyəsi" dərsliyini yazıb çapa hazırlamışdı, ölümündən sonra (1958) kitab işıq üzü gördü.

İlyas bu epizodu elə canlı, elə maraqlı danışdı ki, elə bil həmin anda mən də dərsdə olmuşdum.

Belə hallar tələbəlik dövründə çox olub. Müəllimlərimizin sayəsində içi İlyas qarışığı biz xalq şairi Səməd Vurğunu gördük, onun söhbətlərinə qulaq asdıq, ədəbiyyatımızı yaradan bir çox tanınmış simalarla görüşdük, onlara qulaq asdıq. Bu da müəllimlərimizin xatirəsini əziz tutmağımızın başqa bir sübutudur...

**Əmək semestri**

1957-ci ilin payızı idi. İkinci kursda oxuyurduq. Oktyabrın ortalarında tələbələri pambıq yığımına apardılar. Biz Salyan rayonunun Qırmızıkənd kolxozuna düşmüşdük. Geniş klubun bir tağında bizi, digərində qızlarımızı yerləşdirmişdilər. Dosentlər İsmayıl Şıxlı, Azər Hüseynov dəstəyə təhkim olunmuşdular. Gün batana yaxın sahədən qayıdırdıq. Axşam yeməyindən sonra boş vaxtlarda yenə İlyasın tarı "cövlan edir", rəqs həvəskarlarını meydana səsləyirdi. Beləcə "əmək semestrimiz" noyabrın ortalarınadək davam etdi. Şəhərə qayıdıb nə görsək yaxşıdır? Fakültələr birləşdirilib, adını da qoyublar tarix-filologiya, olmuşuq 75 nəfərlik dəstə, otaqlar necə gəldi bölüşdürülüb, hərə bir tərəfə düşüb...



Biz "bəxti gətirənlərin" həmin dövrdən də təlatümlü ağır günləri başlandı. Hər gün cədvələ iki qoşasaat əlavə dərs salınırdı. $14^{20}$ əvəzinə dərslər saat 10-da başlayır, $21^{30}$-da qurtarırdı – az qala 12 saat çəkirdi. Kitabxanalara, əlavə ədəbiyyat oxumağa vaxt qalmırdı.

"Gəlhagəlli" dövrdə idik. Az sonra Gəncədən Zərdabi adına institutun ədəbiyyat fakültəsini – 135-140 nəfərlik dəstəni Bakıya köçürüb bizə birləşdirdilər. Dördüncü semestrin sonunda əvvəlki kursda saxlanan 40-45 tələbə də bizim dəstəyə əlavə olundu. Beləliklə, 50 nəfərlik "nüvə" dönüb oldu 250-255 nəfərlik "nəhr". Amma bu "izdihamlı" dəstədə içi İlyas qarışıq əlaçılarımız da var idi, zərbəçilərimiz də. Dəstəyə yenə də "ilk" seçimin uşaqları olan 50 nəfərlik "özək" başçılıq edirdi. Beləcə onuncu semestr də "itkisiz" ötüşdü. Qabaqdan ən böyük sınaq – dövlət imtahanları gəlirdi.

## Komissiya sədrinə "irad"

Deyə bilmərəm, bu da tale yazısı idi, "bəxtin gətirməsi", yoxsa təsadüf. Tanınmış alim, filoloq, elmləri doktoru, şərqşünas, tərcüməçi, şair, jurnalist, nəhayət, sanballı kitab və dərsliklər müəllifi, gözəl şəxsiyyət Cəfər Xəndan Hacıyev bizim dövlət imtahan komissiyasının sədri təsdiq olunmuşdu.

İlk imtahanlar uğurla keçdi. Sonuncusu Azərbaycan dilindən idi. Elə "insident" də bu imtahanda baş verdi. Komissiya qarşısında İlyas dayanmışdı. Suallarını danışdı. Sədr soruşdu ki, dilimizdə neçə samit var? İlyas cavab verdi ki, 25, sonra 26 dedi. Yerdən pıçıldadıq. İlyas səhvini düzəldib "23 samit" cavabını verdi. Cəfər Xəndan səsinin ahəngini dəyişmədən eyham vurdu: Düzdür, ancaq gec dedin!

Bu dəm fikirləşirdim ki, bir görün sədr necə böyük ürək sahibidir! O, imtahan verənə çox incə yolla başa salır ki, cavabı düzəltdin, axı, onu uşaqlar pıçıldadılar, mən də eşitdim...

İş bu yerə çatanda İlyas da özünü itirmədi, durdu kişinin üzünə: Müəllim, mənə çətin sual verin, yoxsa samitlərin sayı? Bu, sual deyil. Həm də "öz mövqeyini" təsdiqləyirmiş kimi, əlavə etdi: Bəzən adamdan soruşurlar ki, evinizin neçə pəncərəsi var, çaşıb qalır, halbuki hər gün evə girib-çıxır, pəncərə də göz qabağında…

Bu, hazırcavab tələbənin dar məqamda komissiya sədrinə "iradı" idi, özünü "təmizə çıxarmaq" cəhdi idi. İlyasın cəsarəti, təmkini qarşısında Cəfər Xəndan gülüb başının işarəsi ilə "keç get" dedi.

Həmin "dialoqda" alim təmkini, onun yüksək insani keyfiyyətləri, Cəfər Xəndan etikası bütün parametrləri, incəlikləri ilə gözlərimiz qar-

şısında canlandı. Özgə halda belə bir sadə suala görə məzuna bir il də "möhlət" verər, ona "sadə sualları öyrənməyi" başa salardılar. Elə bu



şübhələr içində İlyas üçün nigarançılıq keçirib var-gəl edirdim ki, bizi içəri dəvət edib imtahan qiymətlərini elan etdilər. İlyas "yaxşı" almışdı.

Beləliklə, tələbəlik dövrü bitdi. Əksəriyyətimiz rayonlara döndük. Mən Ermənistana, Ağbaba elinə qayıtdım. İlyas Laçına yola düşdü. Şəhərdə aspirantura həvəsi ilə qalanlar da oldu. Yazışırdıq. Növbəti məktubda İlyas giley-güzar edirdi ki, "direktor vədi" boşa çıxdı, indi Pircahan məktəbində dil-ədəbiyyat dərsi deyirəm...

Xeyli sonralar öyrəndim ki, ailə qurub, iki övladı var – Təranə və Ülfət. Gün-güzəranından yazırdı, sağlamlığından şikayət edirdi...

### Şair İlyas

Tələbə dostumuz İlyas İbrahimov haqqında çox danışmaq olar. Bəziləri barədə söhbət açdıq. Ancaq onun çox önəmli bir keyfiyyəti də var idi. Bundan əsla yan keçmək olmaz. İlyas hər şeydən əvvəl incə ruhlu, dərin bədii təfəkkürə malik gözəl şair idi. Bu cəhət onun həyatının mənasını təşkil edirdi. Şair İlyası oxucuya geniş təqdim etmək fikrində deyiləm. "Laçın yurdu" dərgisində (№3) bu barədə jurnalist dostumuz Şöhlət Abbas ətraflı söz açıb, nümunələr verib. Biz şairin yaradıcılığı ilə bağlı bir incə məqama toxunmaqla fikrimizi yekunlaşdıracağıq.

Sadə və aydın dil, oxucu qəlbinə yol tapmaq bacarığı, yüksək lirizm onun yaradıcılığı üçün xarakterik cəhətlərdir. İlyas kiçik və adi şeirlərində də maraqlı süjet qurur, canlı lövhələr yaradır, oxucu ilə dialoqa girir, həqiqətin tərəfində durur. Dərgidə verilmiş 12 misralıq "İki məktub" şeiri

bu baxımdan xarakterikdir. Cavan oğlan eyni gündə, eyni vaxtda (görünür, eyni poçtla) iki məktub alır: anasından və sevdiyi qızdan. Hansını əvvəl açıb oxusun, kimə "üstünlük" versin? Tərəddüd və şübhələr başlayır, çıxış yolu tapmır. Xeyli götür-qoydan sonra yenə yekdil qərara gələ bilmir, nəticədə oxucusunu "köməyə" çağırır:

***Deyin, hansı məktubu***
***Tez tələsik açaraq***
***Oxuyardınız qabaq?!***

Belə lakonik nəticə çıxarmaq, oxucu rəğbəti qazanmaq onun yaradıcılığında əsas yer tutur. İlyas bədii sözü belə mənalandırmağı bacarırdı. Sonralar dostlarının köməyi ilə onun şeirlər kitabı buraxılmışdır.

### Atadan gələn məktub

1966-cı il sentyabr ayının ortaları idi. Əlimizdə xeyir iş var idi. Bakıda aspiranturada təhsilini davam etdirən kimyaçı qardaşım ailə qururdu. Poçtalyon mənə bir məktub gətirdi. Ünvana baxdım. Hoçazdan, İlyasın atası Cavad Novruzovdan gəlmişdi. Dərhal dalağım sancdı. Fikirləşdim ki, yəqin İlyasla bağlı bir nigarançılıq, bəd xəbər var. Beləcə zərfi açmadım, qatlayıb cibimə qoydum.

Toy qurtardı, hər şeyi yerbəyer etdik, aradan daha bir gün keçdi. Sakit bir guşəyə çəkilib məktubu açdım. Zənnim düz çıxdı. Cavad dayı böyük kədər, dərin dərd-qəm içində yana-yana bildirirdi ki, ağır xəstəlikdən sonra İlyas yanvar ayının 15-də vəfat etdi. Ata yazırdı ki, oğlumun dəftər-kitabını yığışdırarkən sənin məktubunu gördüm, ünvanı götürüb bu qara xəbəri sənə bildirəsi oldum...

Nə etmək olardı. Əziz tələbə dostumun həyatdan vaxtsız köçməsindən dərin sarsıntı keçirdim, Allahdan ruhuna rəhmət dilədim, sonra Cavad ataya təskinlik dolu bir məktub yazdım, başsağlığı verdim. İlyas, onun şəxsiyyəti, qaynar tələbəlik həyatı dövrünün bəzi məqamları, onun insani keyfiyyətləri, şairlik təbi barədə atanın bildiklərindən və bilmədiklərindən də geniş söhbət açdım, belə oğul yetirən ailəyə, valideynlərə min-min alqış bildirdim, səbr, dəyanət dilədim...

Məktub ünvana çatır. Tələbə yoldaşlarımızdan Cəbrayıl rayon təhsil şöbəsinin sabiq müdiri mərhum Qorxmaz Bayramov (ara-sıra yolunu Hoçazdan salardı) Cavad kişi ilə görüşəndə ata deyir ki, oğul, gedirəm meşəyə yanacaq tədarük etməyə, haldan düşənə qədər kəsib-doğrayıram. Sonra da bir kötüyün üstündə oturub Əsgərdən gələn məktubu oxuyuram. Elə bil qoluma qüvvə, dizimə taqət gəlir. Durub yenə davam edirəm, yükümü tutub evə dönürəm.

Bilirəm, Cavad kişi çoxdan dünyasını dəyişib, Allah rəhmət eləsin. Füsunkar Laçın torpağı, yurd yeri Hoçaz yağı düşmən əlindədir. İlyasın ailəsi, balaları qaçqınlıq həyatı keçirir. Bir ara çox soraqladım, dəqiq yer, ünvan deyən olmadı. Son vaxtlar Təranə və Ülfətin izinə düşmüşəm. Əminəm ki, görüşümüz baş tutacaq. Ancaq bəri başdan deyim: Qəm yeməyin, əziz balalar, siz atanın layiqli varislərisiniz. Əminəm ki, indi ev-eşik sahibi olmusunuz. Əzrayılın "pisliyi özünə qaldı". Fəxr edə bilərsiniz ki, siz şair qəlbli, dağ vüqarlı bir kişinin yadigarlarısınız. İlyas adı, İlyas sorağı, elə bilirəm ki, həmişə və hər yerdə hər birinizin, elə nəvələrin də daim sevinc, iftixar, güvənc yeri olacaq, yolunuza işıq saçacaqdır. Allah sizi qorusun, İlyas İbrahimov yurdunun yadigarları! Görüşənə qədər!

**Yekun sözü əvəzi**

Lətifəsi bizdən uzaq (biz kiçik adamlarıq), Moskva jurnallarından biri geniş tanınmış şair Rəsul Həmzətova zəng vurub Dağıstan haqqında 5-6 vərəqlik məqalə sifariş edir. Fikir onu götürür: nə yazsın, necə yazsın ki, doğma yurdun adına layiq çıxsın, diyarın əzəmətini, varlığını bu vərəqlərə necə yerləşdirə bilsin, yenilməz dağların, insanların qüruru barədə canlı mənzərə yarada bilsin? Nəsə, işə girişir və sonda... iki hissədən ibarət "Mənim Dağıstanım" yaranır.

Əlbəttə, müqayisə çox mübaliğəlidir, bəlkə də yerinə düşmür, ancaq xatirə – qeydlərin mərkəzində duran bu şəxsiyyət öz vüqarı, daxili aləmi ilə ucadır, zirvədir, adına "kitab bağlanası" ziyalıdır, gözəl təqlid nümunəsidir. Cəmi 33 il ömür sürmüş müəllimin, şairin, əziz dostun həyat yolunun bəzi məqamlarını müxtəsər dillə bu şəkildə ortaya çıxarmağa çalışdıq. Necə alınıb, yenə oxucu bilər.



**Əsgər ƏSGƏROV,**
***APİ-nin (ADPU) 1960-cı il məzunu,***
***Azərbaycan Jurnalistlər Birliyinin üzvü***

**P.S.** *Yazı dəqiq fakt və məlumatlara əsaslanır, mübaliğədən uzaqdır. Bu da taleyin bir qismətidir: sanki İlyasla bağlı əksər xarakterik hadisə və nümunələrin iştirakçısı, necə deyərlər, "qeydə alanı" (elə yadda saxlayanı da) olacağammış! Çox güman ki, onunla bağlı digər yoldaşların da yaddaşında müəyyən epizodlar, maraqlı deyimlər qalmamış olmaz. Yazıb "Laçın yurdu"na göndərsinlər. Məmnun qalarıq.*



**Sultan LAÇIN**
***e-mail: slacin1992@rambler.ru***

## LAÇINIM

Ürəkmi ürəyimiz dözür bu dağa, Laçınım?!
Əlimizdən aldı səni bir alçaq dığa, Laçınım!

Qoyduq ar edib papağı, günə verdik neçə il,
Sənsiz necə yaraşır bu baş papağa, Laçınım?!

Neçə oğlun döyüşdü, tökdü qan, oldu şəhid,
Sənə dönük çıxanlar indi xan-ağa, Laçınım!

Düşdük hərəmiz bir elə, könlü dağ, qəlbi yanıq,
Bizə "qaçqın" dedilər - gəldik qınağa, Laçınım!

Ruhumuz etdi pərvaz, qondu Qırxqız zirvəsinə,
Gözümüz Qaragölü çıxdı sorağa, Laçınım!

Həkəri qəlbimizdə ağladı qan, döndü Kürə,
Çırpındı, sığışmadı bəndə-dayağa, Laçınım!

Dedik dəli olarıq, şükür, yerində əqlimiz,
Çatdımı yetmiş min əql bir Dəlidağa, Laçınım?!

Ölmədik ki, yaşadıq, tapdıq hər qazanc yolu,
Bulduqmu sənə yetən bir yol-yolağa, Laçınım?!

Baş, dil-ağız, əl-ayaq işlədi, cəm etdi ruzi,
Çiynimiz yadırğadı amma qundağa, Laçınım!

Çəkdi çoxumuz dərdü-qəm, bir para zövqü-səfa,
Satdı səni rütbəyə, yala-yalağa, Laçınım!

Susduq, amma ki, verdik hər yetənə bolluca səs-
Yetmədi bir sədamız İşıqlı dağa, Laçınım!

Məhəbbət dərd elədi - qoşdu “Laçınım” oxudu,
Biz qol açdıq, oynadıq, cumduq arağa, Laçınım!

İçdik məclisdə hər şərab, narzan, fanta, pepsi, kola-
Təşnə qaldı canımız Turşsu bulağa, Laçınım!

Bişdik hər yay aranda, gah çadırda, gah vaqonda,
Tapmadıq Çalbayırı – qalxaq yaylağa, Laçınım!

Könlümüz bumbuz bulaq, büllur hava, dağ istədi,
Yollandıq qəlbiqara Qubaya, Qaxa, Laçınım!

Hanı at üstdə gəzdiyim zümrüd quzey, boz güneyin?
“Mersedes”lə Bakıda düşdük bozağa, Laçınım!

“Atəşkəs” dövründə şou, pul, maşın qatdı başı -
Aldandıq Abşeronda beş sot torpağa, Laçınım!

İcad etdik hər cürə saxta sənəd, saxta məktəb,
Əslimiz dağda qaldı, döndük yaltağa, Laçınım!

Mədh etdik zülmkarı, qardaş olduq yem verənə -
Başladıq nəslimizdən “danos” yazmağa, Laçınım!

Bir dəfə hayqırmadıq var gücümüzlə adını –
Yardım üstə, ev üstə qalxdıq ayağa, Laçınım!

Saxlatdıq oğlumuzu əsgərlikdən rüşvət verib-
Vəzifə davasında döndük “qoçağa”, Laçınım!

Olduq nəfsin qulu, etmədik Allaha təzim,
Dözmədik iyirmi il sənsiz sınağa, Laçınım!

Tanrı əfv etsin bizləri, yetişsin imdadımıza,
Sarılaq eşqinlə bir gün topa-silaha, Laçınım!

Sultanın hər namazı bu duayla yetər başa,
Uğrunda o dağlarda düşə torpağa, Laçınım!
Uğrunda o dağlarda düşə torpağa, Laçınım!

**POEZİYA**

## Rüstəm SADİQ



Qasımov Rüstəm Əbülfət oğlu (Kərbalayı Rüstəm Sadiq) 1949-cu ildə Laçın rayonunun Oğuldərə kəndində anadan olub. Oğuldərə kənd 8 illik məktəbini bitirdikdən sonra Laçın şəhər 1 saylı orta məktəbində təhsilini davam etdirib. 1968-ci ildə orta məktəbi bitirib. İndiki Gəncə Dövlət Pedoqoji Universitetinin biologiya fakültəsində ali təhsil alıb. Oğuldərə kənd orta məktəbində ixtisası üzrə müəllim işləyib. 1984-cü ildən 2005-ci ilə qədər Oğuldərə kənd orta məktəbinin direktoru vəzifəsində çalışıb. Gənc yaşlarından şeir yazmağa başlayıb. Şeirləri müntəzəm olaraq dövri mətbuatda işıq üzü görüb.

### AĞ GÜL

Durnalara qoşulmusan, uçmusan,
Bu ayrılıq görən səni üzdümü?
Baş götürüb çəmənlikdən qaçmısan,
Yad gözlərdən qorunmağa, düzdümü?

Niyə ağ gül ayrılıqdı deyirlər?
Qəlbim yanır bu kəlmənin oduna.
Niyə gülün xatirinə dəyiblər,
Görən bu söz kimin düşüb yadına?

Bazardüzü ağ gül ilə dolubdu,
Görürsənmi nə gözəldi bu payız.
Görürsənmi mən deyənlər olubdu,
Ağ nağıla bürünübdü dünyamız.

Bu ağ gülün ləçəyini əyməyin,
Gümanımız min tərəfə yozular.
Bu ağ gülə toxunmayın, dəyməyin,
Dünyamızın gözəlliyi pozular.

### PAPAĞI BƏRK SAXLA

Beş-altı gün qalıb kiçik çiləyə,
Bayram yaxınlaşır pay gətirirlər.
Bizi öyrədirlər dilənçiliyə,
Torbada qənd, noxud, çay gətirirlər.

Unutduq keçmişi...siz unutmayın,
Oyan, bu yuxunun sümüyünü qır.
Gedib qapılara torba atmayın,
Torbanı görəndə gözüm ağrıyır.

Yandır öləziyən ocağımızı,
Bəsdi onun-bunun oduna yandıq.
Qoruya bilmədik torpağımızı,
Biz öz gorumuza söyüş qazandıq.

Papağın qədrini onlar bilirdi,
Köhnə kişiləri biz hardan tapaq.
Papağı itirmək ölənlə birdi,
Bərk saxla, başında qeyrətdi papaq.

**POEZİYA**

**Vəliş ZİRVƏLİ**



## YA RƏBBİM, SƏN ÖZÜN KEÇ GÜNAHIMDAN

Qurudu dodaqda nəğmələrimiz,
Aşdı öz həddini dərdi-sərimiz.
Biryolluq bitəydi həsrətlərimiz-
Xan Araz qurusun könül ahımdan,
Ya Rəbbim, sən özün keç günahımdan.

Əydik boynumuzu neçə paşaya,
Neçə nabələdə, neçə naşıya.
Qardaşı qoydular qarşı-qarşıya-
Özüm gülləndim öz silahımdan,
Ya Rəbbim, sən özün keç günahımdan.

Aşılmaz gədiyim, keçilməz qaşım,
Olubdu ömürlük dərdim, təlaşım.
Əsrlər, illərdir bəlalı başım
Bəlalar çəkibdi öz tamahımdan,
Ya Rəbbim, sən özün keç günahımdan.

Nə molla bilibdi, nə də ki qazı,
Ölüb-dirilmişik min dəfə azı.
Tutaram orucu, qılıb namazı
İstixas eylərəm öz Allahımdan,
Ya Rəbbim, sən özün keç günahımdan.

## BİR DƏ

Sənə "salamat qal" demirəm, dağlar,
Gələrəm səninlə görüşə bir də.
Yenə göz oxşaya şux gözəllərin,
Başdan duman şalın sürüşə bir də.

Bir xoruz banına elin oyana,
Günəşin nuruna cahan boyana.
Yenə tüstün çıxa, işığın yana,
Məhlədə itlərin hürüşə bir də.

Ruzigar dəyişə, düzələ halın,
Gəzək zirvəsində Yal yurdun, Çalın.
Arxac qırağında mələşə malın,
Sürülər yayıla örüşə bir də.

Həsrətdən saçına qar yağa-yağa
Hey səni axtarır, düşüb sorağa.
Daha tərk eyləyib getməz uzağa,
O fürsət verilə Vəlişə bir də.

## VAR

*(Mahir Quluyevə ithaf edirəm)*

Çox tərif vurursan yazdıqlarıma,
Hər işin özünün öz sərrafı var.
Duyğulu insanın başqadır yeri,
Ürək sərrafı var, göz sərrafı var.

Tablaş əziyyətə, olma gileyli,
Sənə də zəhmətim olubdu xeyli.
Əyrinin həmişə əyriyə meyli,
Düzün də həmişə düz sərrafı var.

Şeirdi, sənətdi başımın tacı,
Yorulmaz Vəlişin ağarsa saçı.
Ortada mənimtək cızmaqaraçı,
Sənintək bir böyük söz sərrafı var.

**POEZİYA**



## Xuraman CAMALQIZI

Abbasova Xuraman Camal qızı (Xuraman Camalqızı) 1959-cu ildə Laçın rayonunun dilbər guşələrindən olan Alxaslı kəndində anadan olub. Bədii yaradıcılığa 1980-ci illərdən başlayıb. 2007-ci ildə "Durnalar var köçümdə" adlı kitabı işıq üzü görüb. Hazırda Bakı şəhərində yaşayır. Ailəlidir, 3 övladı var.

### KİMİYƏM

Gözündən ağlayan bulaq kimiyəm,
Qulağa xoş gələn soraq kimiyəm.
Elimə - obama elə bağlıyam,
Alxaslıda qalan torpaq kimiyəm.

Bu həyat elə bir dərs verdi mənə,
Yamacda tək qalan qovaq kimiyəm.
Nəyə əl atdımsa oldu tərsinə,
Ünvanı səhv salan qonaq kimiyəm.

Sirrimi saxlamaq istəməsəm də,
Qapıları bağlı otaq kimiyəm.
Hər şeyi özümdən əsirgəsəm də,
Ürəyi tər – təmiz uşaq kimiyəm.

Belə inciməyə, küsməyə baxma,
Vüqarlı, qürurlu Şahdağ kimiyəm.
Bir kitab içində əbədi saxla,
Xəzanda saralan yarpaq kimiyəm.

### GETDİ

Bu necə taledi, qoşa düşmədik,
İllərin sevdası heç oldu getdi.
Günah kimdə oldu başa düşmədik,
Alındı havası, puç oldu getdi.

Kövrək duyğularım yasa boğuldu,
Eşqimin vüqarın sındırıb getdi.
Olub keçənləri xatırlatmadı,
Geriyə baxmadan yandırıb getdi.

Yaxşı ki, aldanıb yuva qurmadım,
Sənin param-parça könlündə, gülüm.
Mənim qüruruma təşəkkürüm var,
Heç vaxt əyilmədi önündə, gülüm.

Ayrılığın abidəsi qurulsun,
Sənin şəklin ora yaman yaraşar.
Üzərində qara çələng qoyulsun,
Vəfasızlar gəlib üstə ağlaşar.

## UNUTMA!

Laçın rayonu 18 may 1992-ci ildə erməni təcavüzkarları tərəfindən işğal edilib.

İşğal nəticəsində Laçın şəhərində, Qayğı qəsəbəsində və 125 kənddə olan 13845 fərdi yaşayış evi, 48 sənaye, 63 kənd təsərrüfatı obyekti, 217 mədəni-maarif, 101 məktəb, 5 məktəbdənkənar, 3 məktəbəqədər müəssisə, 142 səhiyyə, 460 ticarət obyekti itirilmişdir.

Qarabağ müharibəsində 333 nəfər şəhid, 225 nəfər əlil olmuş, 33 nəfər hər iki valideynini itirmiş, 5 nəfər Azərbaycanın Milli Qəhrəmanı adına layiq görülmüşdür.

Laçın rayonu işğal edildikdən sonra rayonun 58299 nəfər əhalisi respublikanın 59 rayon və şəhərində müvəqqəti məskunlaşmışdır.



İki fidan balanı - **Əlini və Gülşəni** ad günləri münasibətilə babaları Hilal, Cəlal, nənələri Sima, Gülşən və bütün doğmaları ürəkdən təbrik edir, onlara bol-bol sevinc arzulayır, Ulu Tanrıdan xoşbəxt həyat diləyirlər:

***Əlinin 7 yaşı,***
***Gülşənin 6 yaşı.***
***Təbrik edir doğmalar***
***Bu cüt bacı-qardaşı!***

Şirin-şəkər balanı - 2 yaşlı Nigarı ad günü münasibətilə bütün doğmaları səmimi qəlbdən təbrik edir, bu balaca qızcığazın xoşbəxt böyüməsini arzulayırlar!

***Təzə-təzə dil açır,***
***Hər sözü bir gül açır.***
***Şirin-şirin güləndə***
***Ətrafına nur saçır.***

Əsməri 3 yaşı, Yaqubu isə 1 yaşı münasibətilə nənələri Əsmətel və Gülüm, atası Eldəniz, anası Ülkər, bibisi Rəfiqə, əmiləri Araz, Hacıbaba, Elməddin, dayısı Ülvi və xalası Ülviyyə təbrik edir, həyatda lik addımlarını atan bu gül balalara xoşbəxt gələcək arzulayırlar!

Bu balaca övladı - 2 yaşlı Poladı ad günü münasibətilə nənəsi Məxmər, atası, anası, bacısı Zümrüd, əmiləri, dayıları, bibiləri və xalası səmimi qəlbdən təbrik edir, ona doğmalarının əhatəsində xoş günlər diləyirlər!